Az 2
2005

**"SƏFƏVİLƏRİN BÖYÜK ÖVLİYASI – MİSKİN ABDAL"**
Bakı, "ŞƏMS" nəşriyyatı – 2005, 386 səh.

***Topladı və çapa hazırladı:*** ***Tofiq Məhəmməd oğlu HÜSEYNZADƏ***

***Elmi redaklor:*** ***Mürsəl İsmayıl oğlu HƏKİMOV, filologiya elmləri doktoru, professor***

***Rəyçilər:*** ***Mahmud Qara oğlu ALLAHMANLI, filologiya elmləri namizədi***
***Qüdrət Umud oğlu UMUDOV, filologiya elmləri namizədi***
***Çapa məsul:*** ***Mehdi Tofiq oğlu HÜSEYNZADƏ***

**Az 99**

**Bu kitab 2001-ci ildə "Səda" nəşriyyatı tərəfindən Azərbaycan Respublikası Milli Elmlər Akademiyasının Nizami adına Ədəbiyyat İnstitutunun Elmi Şurasının qərarı ilə çap olunmuş "Miskin Abdal" kitabının məntiqi davamıdır. Bu kitabda böyük ustadın ictimai, siyasi, ədəbi-dini və digər yüksək insani keyfiyyətləri tərənnüm olunmaqla birinci kitabdan fərqli cəhətləri də vardır. Yəni, bu kitaba böyük sufi şairin yeni əldə olunmuş şeirləri, "Yetim Hüseyn" dastanı, haqqında söylənilən rəvayətlər, əfsanələr, deyimlər, digər maraqlı məlumatlar, "Mehriban ayı» nağılı, şəcərə, habelə "Şadman" poeması daxil edilmişdir. Ümidvarıq ki, kitab oxucular tərəfindən maqala qarşılanacaqdır.**

**X** $\frac{5100000082}{127\text{-}2005}$ qrifli nəşr

# BAŞLANĞIC

"Böyük el sənətkarı ilə bağlı ən böyük həqiqətlərin yeganə qaynağı və ünvanı əsrlərdən bəri göyçəlilərin müqəddəs ziyarətgahı, iman, güman yeri olan Miskin Abdal ocağıdır. Göyçənin Sarıyaqub kəndində Miskin Abdalın doğulduğu, övladlarının 1988-ci ilin məlum hadisələrinə qədər yaşayıb-yaratdığı doğma ocaqdır.

Məhz bu səbəbdəndir ki, Miskin Abdal nəslinin həqiqi varislərindən olan Tofiq Hüseynzadənin öz ulu babası ilə bağlı son illərdə apardığı axtarışlar diqqəti daha çox cəlb etməkdədir.

O, Sarıyaqub kəndinin dünya yorub yola salmış nurani, pirani ağsaqqal və ağbirçəklərinin dillərindən düşməyən əfsanələri, rəvayətləri, şeir və dastanları, "Ocağ"a sahiblik edən qohum-əqrablarının Miskin Abdalla bağlı zaman-zaman, nəsillərdən-nəsillərə ötürdükləri ölməz həqiqətləri böyük məhəbbətlə toplayıb, bir araya gətirmiş, bir çox qaranlıq mətləblərin obyektiv elmi şərhinə gözəl imkanlar yaratmışdır. Sənətkarla bağlı söylənilən fikirlərin, mübahisəli məqamların dürüstləşdirilməsində onun apardığı axtarışların mühüm əhəmiyyəti vardır".

***Hüseyn İSMAYILOV,***
***(Azərbaycan MEA-nın Folklor İnstitutunun direktoru,***
***filologiya elmləri doktoru)***

**Azərbaycan Milli Elmlər Akademiyasının Nizami adına Ədəbiyyat İnstitutunyn Elmi Şurasının qərarı ilə 1999-cu ildə çap olunmuş "Azərbaycan şifahi xalq ədəbiyyatına dair tədqiqlər" kitabındakı (8-ci cild, səhifə 104) "Miskin Abdalın şəxsiyyəti və taleyi" (uydurmalar, həqiqətlər) sərlövhəli elmi-təhqiqat yazısından**

# TANRI MİSKİNİ –
# HAQQ CARÇISI

Türkün mənəvi-əxlaqi, dini-ruhani, elmi-irfani, ədəbi-ictimai, sosial-mədəni dəyərlərinin mürəkkəb sintetik vəhdətinin ən optimal reallaşma faktı kimi Miskin Abdal şəxsiyyəti nadir simalardandır. Beş əsrdən artıqdır ki, onun mənəvi dünyasından gələn tükənməz enerji bir qaynaq olaraq özündən sonrakı dövrlərin ədəbi mühitini həyat işığı, ilahi eşq fəlsəfəsi və coşrun könül tərənnümləri ilə qidanlandırıb; sufi aşıq olaraq sazın funksional imkanlarından da maksimum istifadə etməklə Məhəbbətin Eşqə, Təmizliyin Saflığa, Ehtizazın Ekstaza, İdrakın Vəhyə çatmasını, Kamilliyin Həqiqətə çevrilməsini öz müdrik şəxsiyyətində və zəngin yaradıcılığında mükəmməl şəkildə təqdim edə bilib. Bu böyük şəxsiyyətin həyatı, fəaliyyəti, xüsusilə, ədəbi yaradıcılığı və sənətkarlığı demək olar ki, öyrənilməyib. Miskin Abdalla bağlı elmi araşdırmaların məhdudluğunu da nəzərə almaqla sözügedən şəxsiyyətin və onun çoxistiqamətli fəaliyyətinin aşağıdakı kontekstlərdə öyrənilməsi vacibdir:

1. Miskin Abdalın şəxsiyyəti;
2. Miskin Abdalın sosial statusu;
3. Miskin Abdalın sufi statusu;
4. Miskin Abdalın sənətkarlıq fəaliyyəti;
5. Miskin Abdalın siyasi fəaliyyəti.

Miskin Abdalın yaradıcılığının, bütövlükdə, sufizm epoxası konteksində araşdırılması isə öncə onunla şərtlənir ki, hər bir dövrün insanı mütləq öz fəaliyyətində hakim dünyagörüşün diktəsi altında olur. Ədəbi yaradıcılıq da birbaşa dünyagörüşlə

bağlı hadisədir. Həmin dövrün (XV-XVI əsrlər) hakim dünyagörüşü ortodoksal islamın və sufizmin əsas müddəaları və təməl prinsipləri ilə şərtlənir.

İslamın əsas müddəası – ''Allahdan başqa allah yoxdur'' (La ilahə illəllah) bütün müsəlman arealında dominant tezis

---

**««Təsəvvüf – sufilik hər bir yüksək xasiyyətə yiyələnmək, hər bir naqislikdən uzaqlıqdır» (Əbu Mühəmməd Cəriri).**

**Təsəvvüf sürəkli şəkildə Allaha ehtiyac və bu ehtiyacı ödəmək hissi və yoludur. Təsəvvüf yolunda birinci mərhələ elm, ikinci mərhələ əmək, üçüncü mərhələ ilahi vergidir. Elm muradı aşkar edir, əmək tələbi müəyyənləşdirir, ilahi vergi isə ümid qayəsinə çatdırır. ''Dünya ilahi vücudu əks etdirən güzgüdür, dünya zahiri cəhətdir. Həqiqətə çatmaq üçün zahiri cəhətdən üz döndərib, şəxsən mövcudluqdan xilas olmaq lazımdır. Sufilərə xas olan vəcdə gəlmək meyllərinin məntiqi inkişafı belədir''.**

**Sufi yolu – Ali həqiqət axtarışı yoludur. O, bu yolu başa çatanda özü olur, müstəqil olur. Yəni onun məqsədi əslində özünə çatmaq, özünə qovuşmaqdır.**

**Materializmcə, dünya göründüyündən artıq deyil. Dünya dünyayla məhduddur, bəsitdir. İdealizmcə, dünya dərk olunduqca böyüyür, ülviləşir, müqəddəsləşir. Dünya dünyadan kənara çıxır. Sufi təfəkkürü mateialist dünyasından doğan idealist dünya mənasını, yəni Ağılla Ruhun qovuşuğunu təsdiqləyir. Əslində, dünyanın mahiyyətini dərk etməyincə, idrakın sonuncu mərhələsinə – Haqqa yetişmək mərhələsinə çatmaq olmaz. Bu məqamda dərk olunmuş dünyanın mənasının özündən böyüklüyü görünür və Haqqa yetişdə Ali Vəcd, Ali Ehtizaz, İlahi Vəhy iqtidarına sahib olunur.**

**Sufi fəlsəfəsi insan aqibətini şərh, təhlil və təyin edən müdriklikdir. Bu fəlsəfi cərəyan təkcə araşdırılmalı deyil, inkişaf etdirilməlidir. Bu təfəkkür insanı fasiləsiz olaraq İdeala – Haqqa yaxınlaşdırır. Ruh dünyaya sığmır, dünyadan yüksəkdə dayanıb, onun mənasından danışır. Bu fəlsəfədə Haqq arzu olunanın, istənilənin Ali Təzahürüdür.**

**Təsəvvüf 4 mərhələdə, 40 məqamda Məqsədə gedən yoldur:**

**1. Şəriət;**
**2. Təriqət;**
**3. Mərifət;**
**4. Həqiqət.**

**Birinci mərhələdə din tərəfindən qəbul edilmiş qanun və vəzifələr yerinə yetirilir. İnsan bu mərhələ iiə özünü nizamsızlıqdan qurtarır.**

**Əslində şəriətin müəyyən dərəcədə gətirdiyi xof – əqlin xilafınadır. O, hər şeyin səthini duydurur. Şəriət özü insanı zahiri davranış vasitəsi ilə Allaha sevdirən bir yol kimi – mistik xəyalpərvərlik, ekstaz və vəcd vasitəsi ilə Allaha yaxınlaşdıran digər yolun – Təriqətin on mərhələsi deyil, əksidir, qarşıduranıdır. Şəriətin şərtləri – iman, elm, namaz, zəkat, oruc, həcc, cahad, sünnət, şəfqət, heyz və cinsi əlaqələrin haramlığı, naqislikdən xeyir əmələ yetməkdir və s.**

**Bəktaşilik təriqətinin ideoloqu – orden başçısı Hacı Bəktaşi Vəli, qulun Tanrıya yetişdiyi  qırx məqamı bu cür sistemləşdirmişdir.**

**İkinci mərhələ sufizmin əsas, mənəvi cəhətdən artma, daxili özüylə döyüş mərhələsidir. Təriqət yol deməkdir. Yolun uzunluğu təsəvvüf yolçusunun öz qüdrətindən asılıdır. Təriqət hallar və məqamlar silsiləsində bütövləşir.**

**Məqam – kamillik mərtəbəsidir.**

**Hal – hər bir məqamı, mərtəbəni tamamlayan, yolçunu yeni məqamlara hazırlayan və nəhayət, Haqqa qovuşduran ilahi vergidir. Hal qəfil gəlir, ani olur. Məqam sabitdir, tam psixoloji vəziyyətdir.**

**Özünəhesabat, özünənəzarət və daxili müşahidə – hal və məqamlardır. Sührəverdiyə görə, hər hansı bir halın məqama çevrilmək imkanı var. İlahi vergilər  tükənməzdir, məhdudluq yalnız onun hər bəndə tərəfindən qavranılmasıdır. Sufi  o qədər kamilləşməlidir ki, sağkən təlqin və hallarla öz Ruhunu öz cismindən çıxarmağı bacarsın!**

**Təriqət – təmizlənmələr, təblər, vəhylər silsiləsidir. Sufi mütəfəkkir Əl-Qəzalı deyirdi: ”Şəriətə hamı əməl edə bilər. Əsl çətin yol təriqətdir. İnsan öz nəfsini paklaşdırdıqdan sonra yeni bir məqama qədəm qoyur – sidq və səmimiyyət zirvəsinə yüksəlir.**

**Təriqətin şərtləri – bəd əməllərə tövbə, mürid olmaq, təraş və sufilərə xas birçək, geyim – xirqə, nəfssizlik, məqam sahibi, məhəbbət sahibi olmaq, eşq, şövq, səfa, fakirlik yiyəsi omaq, dərviş geyimləri – səccadə, təsbeh, iynə, əsa və s. özündə gəzdirmək, ümid etmək, paklanmaq və sairdir.**

**Bu mistik yolda sufilərin özünü təhsili – hücrə mehrab üsulu əvəzsizdir. Özünütəhsil fərdi proses olmalıdır. Zahiri təhsil ixtisasçılığa xidmət edir. Heç bir məktəb İnam, İdrak, Mənəviyyat, İradə vermir. Özünütəhsil, özüylə döyüş əsl Kamil İnsan yaradır. Sufizm təriqətində İnsan şəraitdən güclüdür. Ən pis şəraitdə ən yaxşı İnsan olmaq olar. Özüylədöyüşün son nəticəsi Saflıq gətirir. Əsl sufinin Mahiyyəti Təzahürünə bərabər olmalı,**

**mənəviyyatı Əməllərində zöhr etməlidir. Sufilər yaradıcılığı mövcudluğa bərabər olanlardır. Şah Xətai kimi! Şeyx Şamil kimi!**

**Təriqət yolçusu şəhvətin cismani nəşəsevərliyindən xilas olmalıdır. Eşqi ülviləşdirib cismanilikdən çıxarmalıdır. Eşqin İlahi mahiyyəti onu sarsıtmalıdır. Gözəlliyi ilahiliyin cismani təzahürü kimi müqəddəs saymalıdır (Nəsimi Aşiqliyi ilə Vaqif şəhvaniliyi hüdudsuz ayrılıq təşkil edir. Çünki, Nəsimi sufi-hürufidir!) Gözəlin köynəyinə Kəbə örtüyü kimi səcdəyə duran Ələsgər bu Eşqin abdalı, quludur. Təriqət yolçusu gözün gördüyü zahiri gözəllikdə, idrakın sevdiyi daxili gözəlliyin vəhdətini axtarmalıdır.**

**Üçüncü təsəvvüf mərhələsi mərifət adlanır. Nadan şərçilər sufilərin hadisəyə passiv, hərəkətsiz münasibətini, bütün ümidləri taleyə, təvəkkülə bağladıqlarını bildirir, sufizm yolçularını fatalist, mütləq zərurəti Allaha bağlayan, ”bəlaya aşiq olan” fanatiklər, dəlilər adlandırırlar. Dayazlar, mahiyyətsizlər, – kamil sevgini, kamil təfəkkürü olanları, ”mərifət elmindən dolu” olanları dəli – məcnun adlandırırlar. Füzuli deyir:**

**Eylə sərməstəm ki, idrak etməzəm dünya nədir?**
**Mən kiməm, saqi olan kimdir, meyi-səbha nədir?**

**Ağlın, idrakın bu ucalığında onun anlayıb-bilmədiyi şeylər həmin xırdalar, xəbərsizlər, nadanlar, mərifətsizlərdir. Füzuli öz məcnunluğuyla dayazlıqları rədd eləyir. İnsanda fikri qüvvə yoxsa, təhlil, tədqiq haradan olsun? Müdrikliyi, müdrik kəlamı pisləyən adam üzürlüdür, neynəsin, anlamır, ona qaranlıq görünən hər şeyi pisləyir. Mahiyyəti tam Təzahürə çevirmək istəyən Sufi, mühitə – həyatlaşmağa uyğunlaşmaya meylli olan mühitə qarşı durmalı, bu mühitdən imtina etməlidir. Mərifət məqamları daxili təkan və bu mübarizədə qüdrət və iradə tərbiyə edir.**

**Mərifət məqamlarında Sufi daxilindəki miskinliklə, zəlilliklə, köləliklə döyüşüb Tanrı miskininə, Tanrı quluna, İlahi Eşq xəstəsinə çevrilir.**

**Özünü dərk edən Sufi deyir: ”Mən dünyaya yeyib-içməyə, nəsil artırmağa, ölməyə gəlməmişəm. Mən mənim dünyamı dərk edib, Ali İnsani Kamilliyə çatıb, sonsuz olmağa, müqəddəsləşməyə – Aqibətim deyirəm. Mərifət mərhələsi ilahi güc və bilik verir.**

**Sonuncu – 4-cü mərhələdə təsəvvüf yolçusu Ucalar Ucası qarşısında zərrəyə döndüyünü və bu Ucalığın bir zərrəsi olduğunu dərk edir, sirlər onun qarşısında pünhanlığını itirir, kamilliyə-pirliyə yetişən sufi ”mülk sahibinin ətəyinə üz qoyur”, işıqlanır, nur saçır, vəhylər, ehtizazlar, vəcdlər içində Bəxtiyarlığa və Sonsuzluğa qovuşur. O, İlahi Eşqinə minacatlar deyir. İlham bədahətən, fasiləsiz çuğlayır onu. Bu, Həqiqətə qovuşma mərhələsinin möcüzələridir.**

kimi qəbul olunur. Sufi redaksiyası isə Tanrıya (Allaha) münasibəti ”Allahdan başqa heç nə yoxdur” müddəasında ifadə edərək, hər şeyin Ondan yarandığını və hər şeyin Ona dönəcəyini (İnna lillahi və inna ileyhi raciun), məhz, ’’Qurani Kərim”in özündən çıxış etməklə din üzərində, onun əsasında fəlsəfə yaratdı. Bu fəlsəfəyə görə, Tanrıya qovuşmaq, (Vəhdəti-vücud) onda ərimək (fənafillah), mürəkkəb vəhdətin – tamın üzvi hissəsinə çevrilmək üçün ürfani davranışların xüsusi funksional modelləri, təlimləri və qaydaları vardır. Sufi kontekstində ’’miskinlik və abdallıq” da xüsusi ruhani davranış kateqoriyaları kimi çıxış edir. Bu kateqoriyaların bir şəxsiyyəti ad səviyyəsində simvollaşdırması iki kateqorial istilahın bir şəxsiyyətə rəmzləşdirməsi (iki kateqorial terminin bir şəxsiyyətə aid olması) o deməkdir ki, həmin kateqoriyaların (’’miskinliyin” və ’’abdallığın”) həm sosial kontekstdə, həm də mətn kontekstində xüsusi differensial funksional semantikası vardır. Funksional semantika iyerarxiya təşkil etmir. Yəni ’’miskinliyin” və ’’abdallığın” işarələdiyi anlayış, məna, bir-birini əvəz edə biləcək vahidlərin münasibəti (paradiqmatik münasibət) səviyyəsində deyildir. Əksinə, onlar arasında ardıcıllıq (sintaqmatik münasibət), səbəb-nəticə (determinativ) əlaqəsi vardır. ’’Fənafillah” səviyyəsinə yüksələn, ali məqama yetişən Miskin Abdal Tanrı həqiqətini anlamaq yolunda ’’miskinləşmiş”, ’’qullaşmış”, ’’zəlilləşmiş”, haqq carçısına çevrilərək ’’Abdal” adını almışdı.

***(Hüseyn İsmayılov, «Miskin Abdal” kitabı – Bakı, 2001)***

---

**Xirqə geyinmiş, adi insani tələblərdən belə, rifahından, dünyəvi həzzlərdən imtina edən təriqətçinin özündən keçməsi – özündən yüksəkdə zühur etməsinə gətirib çıxarır. O, özündən kənardakına can ataraq, özünü cismani əzablara salır və bu əzablar – ’’bəlayi eşq” ona həzz verir. Haqq Aşiqinin istedadı, fədakarlığı, əzab və işgəncəyə tab gətirməkdir. Göysevər Aşiqin Həqiqəti – O, göylər Sahibinə qovuşmaqdır.» (Hacı Bəktaşı Vəli ’’Məqalət”, Ankara, 1990. Z.C.Məmmədov «Azərbaycanda XI-XIII əsrlərdə fəlsəfi fikir”, Bakı 1978).**

# SAZ VƏ TƏSƏVVÜF

Bir zamanlar Şumer-Babil, qədim Yunanıstan, Cin və Hindistan, sonralar isə islam dini ilə gələn Şərq fəlsəfəsində mövcud olan kompleks elmi araşdırmalar orta əsrlərə yaxın dövrdən başlayaraq differensiallaşdı. Yəni, belə demək mümkünsə, elm parçalandı. Lakin bu parçalanma bizim anladığımız elm sahələrinin yaranması məsələsi deyil. Konkret elm sahələri hələ 8-9-cu əsrlərdən formalaşmağa başlamışdı. İsna-əşəri imamlarının beşincisi olan Mühəmməd Bağirin (ə.s) künyəsi, göründüyü kimi, ”Bağir” idi. ’’Bağir”, ərəb dilində ’’elmi parçalayan” deməkdir. Yəni mövcud olmuş vahid fəlsəfə elmləri kompleksinin konkret elm sahələrinə bölünməsi məsələsi ortaya çıxmışdır. Təbii ki, imamın övladları və tələbələri bu yolu elm tarixində iz salacaq bir şəkildə davam etdirmişlər. Sonralar Əbu Nəsr Farabi, Xacə Nəsir Tusi, Əbu Əli ibn Sina, Bəhmənyar ibn Mərzbani, Əbu Reyhan Biruni və başqa alimlər öz möhtəşəm elmi araşdırmalarında, yuxarıda dediyimiz məsələyə uyğun olaraq, araşdırdıqları mövzulara bir yox, bir neçə, demək olar ki, fəlsəfəyə ilahiyyat nöqteyi-nəzərindən, elm sahələrindən yanaşmışlar. Elə buna görə də onların irsi bu gün də elmi laboratoriya şəklində mövcuddur. Buradakı bir əsas motiv də bu alimlərin yanaşma tərzindən uzaq düşməmələridir. Əksinə, onlar metafizik üsullarla hər bir maddənin, cismin, onların ruhi enerji daşıyıcısı olmasının, yəni cövhərin və ərəzin İlahi, Mütləq, Ali enerji mənbəyi olan başlanğıca bağlı olmasını sübut etməyə çalışmışlar. Bəlkə də onların kompleks elmi araşdırma prinsiplərini təyin edən atribut da elə, ilahi başlanğıc və ilahiyyat elminə istinadları olmuşdur.

Sonralar elmdə differensiallaşma getdi. Bunun hansı – mənfi, insanlığın əleyhinə olan prinsiplərə səbəb olduqları isə göz qabağındadır.

Bu məsələ ədəbiyyat, incəsənət, folklor və digər humanitar sahələrə də dərin nüfuz etmişdir. Belə ki, klassik şairlərə yalnız bir şair kimi, aşıq və ozanlara bir sənətkar kimi (və sairə ünsürlər nəzərə alınmaqla) yanaşılır, nəticədə isə bütöv bir baxış hasil edilmir. Xüsusilə, son, Sovetlər birliyi dönəmində bu faktor daha vulqar, daha birmənalı və eybəcər şəkildə özünü büruzə vermişdir. Az qala M.Füzuli bir ateist və cismani gözəllik düşkünü, yaxud, tutaq ki, Aşıq Ələsgər sadə bir kəndli sinfinin nümayəndəsi olan sənətkar kimi qələmə verilirdi.

Bu gün isə bu qəliblər, bu qadağalar yoxdur. Fəqət bu qəlibləri, bu qadağaları insan şüurundan, alim təfəkküründən silib atmaq o qədər də asan məsələ deyildir. Üstəlik də nəzərə alsaq ki, alimlərimizin qədim və orta əsrlər Şərq mədəniyyəti, Şərq dilləri, ürfani-mistik dünyagörüşü haqqındakı məlumatları məhduddur, onda bu məsələ daha qabarıq şəkildə özünü büruzə verir.

Yaxın və Orta Şərqin müştərək təfəkkür məhsulu olan ürfan və təsəvvüfün bu cəhətdən öyrənilməsi çox vacib olan bir qaynaqdır. Belə ki, bu məlumatlara və onların daşıyıcılarının həyat tərzinə bələd olmadan biz klassik ədəbiyyatımızın, folklorumuzun, musiqimizin hərtərəfli araşdırılması sahəsində tutarlı heç nə əldə edə bilməyəcəyik. Biz sadəcə olaraq, onları toplayıb, nəşr edib, xalqa çatdırmaqla məşğul olacağıq. Əlbəttə, bu özü gərgin zəhmət tələb edən müqəddəs bir işdir. Lakin bir anlığa diqqət edək. Mərhum Şeyx Heydərin oğlu Şah İsmayıl bir şerində belə yazır:

**«Bir gün ələ almaz oldum mən sazım,**
**Ərşə dirək-dirək çıxdı avazım.**
**Dörd şey vardır bir qarındaşa lazım:**
**Bir elm, bir kəlam, bir nəfəs, bir saz».**

Oxucu bunun fərqinə varmır, bu dörd nəsnəyə olan şair iddiasına nəzər yetirmir. Çünki, mətləbdən bixəbərdir. Onun üçün şeirdə adı çəkilən ”saz” adı bir musiqi alətidir, ”elm” bilikdir, ’’kəlam” şairlikdir, ’’nəfəs” isə yəqin ki, səsdir – avazdır. Bu, ilk baxışda məntiqli görünə bilər. Əslində isə məsələyə bu cür bəsit yanaşma kökündən yanlışdır, mahiyyətcə qələtdir. Oxucu və alimlərimiz düşünmək istəmirlər ki, ölkələr fəth edən, taxt quran, mərkəzləşmiş dövlət yaradan bir şəxs niyə ’’kamil insan” formulunu yaradan şərtləri bu dörd şeydə görür? Bir az sonra qatı açılmamış mənbələrə istinad etməklə biz məsələnin mahiyyətinə varmaq istəyəcəyik.

## Çox qədim əfsanə

Təsəvvüf dərvişlərinin yazılı və şifahi arxivlərində ”Saci-nar” adlı bir dastan var. Dastanın qısa məzmunu belədir:

Yeddi min il göydə qanad çalan, zər qanadlı mələk Cəbrail Həqq Təalanı axtarır, onun camalını seyr etmək istəyir. Lakin buna heç cür müvəffəq ola bilmir. Çünki Həqqi görmək onun qüdrətində deyil. Cəbrailin yalvarışlarını, dualarını eşidən Allah mələklərə görünmək qərarına gəlir və insanı xəlq edir. Bu barədə İslam peyğəmbəri Hz.Mühəmmədin (ə.s) mübarək hədisi də var. Peyğəmbər buyurur: ’’Allah Təali özünü büruzə vermək istədi və insan yaratdı”.

Dastanda daha sonra deyilir: Adəmin (ə.s) bədəni xəlq edil-

dikdən sonra müqəddəs ruh o bədənə daxil ola bilmirdi. Çünki, xilqətdən insan bədəni murdarlıq və nəcasətdən ibarət idi. Elə bu anda Həqqin öz əmrilə mələklərdən biri (Cəbrail) saz olaraq Adəmin qucağına düşür. Sonra digər mələk (Mikail) o sazın simlərinə dönür. Ən sonda bir mələk də (İsrafil) sazın səsinə çevrilir. Elə ilk pəncədən, ilk avazdan ruh məst olur və insan bədəninə daxil olur.

Bu dastan burada xətm olur. Şah Xətai şeirlərinin birində deyir: ”Bir saz olub gəldim dilə”. Məhz bu səbəbdən də illər boyu Xətainin bu misrası anlaşılmaz olaraq qalıb. Çünki, yuxarıda dediyimiz kimi, insanlar ürfani qaynaqlardan bixəbər idilər.

## Təriqət axını

Sufi təriqətlərində musiqinin və musiqi alətlərinin rolu çox mühüm sayılır. Ən azı ona görə ki, onların düşüncələrinə görə səs sözdən və rənglərdən daha dərin və mənalıdır. Elə müqəddəs Qurani-Kərimin avazla oxunuşu da, yəqin ki, bu səbəbdəndir.

Böyük arif Mövlana Cəlaləddin Ruminin məşhur ’’Məsnəviyi Kəbir” əsəri bu beytlə başlayır:

**«Beşnoəz ney, çün hekayət mikonəd,**
**Əz çüdayiha şikayət mikonəd».**

(’’Eşit neyin nalələrini, hekayət eləyir,
Ayrılıqlardan şikayət eləyir”).

Burada, ney qamışlıqdan qoparılandan sonra deşilib, üfürülür və nalə çəkir, çünki öz məkanından qopmuşdur. Əslində isə burada motiv insandır. Qurani-Kərimdə xəbər verildiyi

kimi, Ələst deyilən lahut (ruhlar) aləmində insan var idi. Və Həqq-Təala ilə vəhdətdə idi. Bir müddəaya əsasən isə, insan ruhu bu gün də oradadır, doğularkən ayrılıb bu dünyaya gəlir və doğulan kimi ağlamağa başlayır. Bu ağlayış həmən ney səsidir ki, ayrılıqdan şikayət edir.

Bütün bu qaynaqlara istinadən söyləmək mümkündür ki, musiqi təsəvvüf və ürfan çevrələrində özünə aparıcı yer tapmışdır. Musiqi vasitəsilə dərvişlər zikr edir, hal və trans mərtəbəsinə qalxır, ’’səma” edir və s.

Müxtəlif təriqətlərdə müxtəlif musiqi alətləri istifadə olunmuşdur. Demək olar ki, hər bölgədə o xalqın mədəniyyətinə uyğun musiqi aləti ifa olunmuşdur. Məsələn, Gilan və Kirmanşah dərvişlərində tənbur aləti istifadə olunur. Bağdad dərvişləri ney və dəfdən istifadə edirlər. Səfəvilər dövründə Şah İsmayılın sarayında çoğur adlı bir alətdən istifadə olunmuşdur. Şah Xətainin sarayında təkyənin olması yəqin ki, ehtimal oluna bilən haldır. Bundan əlavə, Ərdəbil, Təbriz, Urmiya təkyələrində çoğurdan istifadə olunmuşdur. ’’Çoğur” sözü bəzi araşdırmalara əsasən, ’’çağır”, ’’çağırmaq” sözündən, yəni Allahı çağırmaq mənasından irəli gəlir. Bu alət də tənbur kimi simli, lakin mizrablı alətdir və istər tembr, istərsə də quruluş cəhətdən saza çox bənzəyir. Bəs bu alətlərdən saza keçid (söhbət təkyə mühitindən, sufi ayinlərindən gedir) necə olmuşdur?

## İddialı ehtimal

Maraqlı cəhət odur ki, orta əsrlərdə Ərdəbil, Təbriz mühitində aşıq-saz üslubu, belə bir musiqi janrı geniş təşəkkül tapmamışdı. Bu, əslində mümkün də deyildi. Şah Xətai özü Gilan və Lahican bölgələrində olarkən tənbur çalarmış. Bir fakt da

mövcuddur ki, Şah Xətainin bağlandığı Şeyx Cüneyd, Şeyx Heydər silsilə təkyəsi sırf Azərbaycan – Türk təfəkkür tərzində formalaşmamışdı. Əsərlərin, şeirlərin ərəbcə və farsca yazılması, həmin dövrün dini və saray mədəniyyəti təsiri bu amilləri formalaşdırırdı. O zamanlar yaranmış Əhli-Həqq Goran təriqətinin tanınmış şairlərindən olan Beyrək Quşçuoğlu kəlamlarının birində belə deyir:

**«Padşahın o donda ikən,**
**Saf Goranı söylədi.**
**Şükr, bu dona gələli,**
**Türkü göftara çəkdilər».**

Göründüyü kimi, farsdilli ədəbi-mistik ifadə tərzlərindən türk dilinə keçid üçün Quşçuoğlu Beyrək Allah Təalaya şükr edir. Aşiq Qurbani isə belə deyir:

**«Bu dünyada bir Haqq divan,**
**O dünyada cənnət məkan.**
**Qoy var olsun Türki-zəban,**
**Şah Xətai, Şah Xətai».**

Məlum olduğu kimi, hər bir musiqi aləti onu istifadə edən xalqın dilinə, təfəkkürünə uyğun formalaşır. Məsələn, İran tarı ilə heç vaxt M.Füzulinin qəzəllərindən ibarət muğam parçaları ənənəvi klassik tərzdə oxuna bilməz. Yaxud da kürd tənburunda heç vaxt Azərbaycan saz havasını uyarlı qaydada çalmaq olmaz. Yəni, onların tembri, lad xüsusiyyətləri buna imkan vermir. Burada bir haşiyəyə çıxmaq istərdik. Azərbay-

can sazında və saz havalarında işlənən ladlar muğam ladları olan ”Rast”, ”Şur” və ”Segah”dır. Bu lad sistemini Ü.Hacıbəyov belə müəyyənləşdirmişdir: ”Rast”, “Şur”, ”Segah”, ”Çargah”, ”Bayatı-Şiraz”, ”Humayun”, “Şüştər”. Sazda bu sistem məhduddur. Bu ondan irəli gəlir ki, Humayun, Çargah, Bayatı-Şiraz kimi muğamlar müştərək Şərq musiqi təfəkkürünün birgə məhsuludur. Məhz buna görədir ki, bizim muğam musiqimizdə və onun aparıcı ümumşərq aləti olan tarda bu muğam və ladlar geniş şəkildə istifadə olunur. Sazda məsələ daha milli və konservativdir. Tutaq ki, ”Rast” ladında ”Ruhani”, ”Orta Sarıtel”, ”Segah” ladında ”Dilqəmi”, ”Yanıq Kərəm”, ”Şur” ladında isə ”Osmanlı divanici”, ”Ovşarı” və başra havalar işlənir. Burada, istisna olaraq “Mənsuri” havasını qeyd etmək olar ki, bu hava ”Şüştər” və “Bayatı-Şiraz” ladlarının qohum münasibətindən törəyib. Bu ladlar isə, əsasən, fars, hind, ərəb musiqilərinə mənsubdur. “Mənsuri” havasının adı da, tembri də, verdiyi hissi təsir də onu göstərir ki, bu hava qədimdir. Bəlkə də, böyük sufi mütəfəkkiri, ürfanın ilk şəhidi olan Hüseyn ibn Mənsur Həllacın adı ilə bağlıdır. Üstəlik onu da qeyd etmək olar ki, bu gün Nemətullahi, Qadriyyə, Bəktaşi və Əhli-Həqq təkyə mərasimlərində bu hava tənbur alətində olduğu kimi çalınır.

Yuxarıdakı məsələyə qayıdaraq, onu söyləmək olar ki, Şah Xətai və Səfəvi müridlərinin məhz saza və saz havalarına olan meyli və məhəbbəti bir qədər kənar regionun təsiri faktına əsaslana bilər. Belə ki, Şah Xətainin ulu Göyçə mahalına gəlişi, böyük mütəfəkkir, möcüzəli sufi mürşidi Miskin Abdalla görüşü bizə əsas verir ki, Səfəvi hökmdarının Azərbaycan sazına sevgisi və onun əzəmətli ahənginə, zəngin imkanlarına valeh olması bu cəhətdən izah edilə bilər. Yəqin ki, Şah Xətainin sırf

saza bağlılığı məhz Miskin Abdaldan və Göyçə mühitindən gəlir. Bu məqamda ”Şah Xətai və Miskin Abdal” dastanındakı bir epizoda müraciət etmək yerinə düşərdi. Dastanın bir yerində Miskin Abdal Xətainin babaları ilə olan dostluq və yəqin ki, ruhani bağlılıq olan pir-mürid əlaqələrindən söhbət açır. Miskin Abdal Əhli- Həqq idi. Yəni, konkret bu təriqətə mənsub idi. Onların varisi Şah Xətai isə özünü Əhli-Həqq adlandırır. Burada silsilə məqamına bir qədər diqqət yetirməyinə dəyər. Məlumdur ki, təsəvvüf elmi 4 qapıdan və 7 mərhələdən keçir:

**1. Şəriət;**
**2. Təriqət;**
**3. Mərifət;**
**4. Həqiqət.**

***Bu qapıların hər biri isə 7 mərhələyə bölünür:***

**1. Tələb;**
**2. Eşq;**
**3. Mərifət;**
**4. İstiğna;**
**5. Tövhid;**
**6. Heyrət;**
**7. Fəna.**

Şeyx Səfiəddin İshaq Ərdəbilinin elmi və əqidəsi şəriəti adlamış, təriqət və ”elmi-xəfi”yə, yəni gizli elmə söykənən bir orden idi. Onun övladları da bu yolu davam etdirdilər. Yəni, təriqət mərhələsində qaldılar. Başqa sözlə, Həqiqət mərhələsinə yetişmədilər. Bu, tarixi baxımdan da məntiqə uyğun gəlir. Tarixi nöqteyi-nəzərdən ürfan elminin Həqiqət pilləsi o dövrdə, belə demək mümkünsə, kəşf olunmamışdı. Adı və məkanı Əh-

li-Həqqlər tərəfindən gizli saxlanılan bir zat, bir şəxs tərəfindən Həqiqət iddiası yalnız XV əsrə yaxın dövrdə zühur etmişdir. Bu baxımdan, Miskin Abdalın həmin şəxslərlə görüşü və bu əqidəni qəbul etməsi faktı də elmə hələ ki, qaranlıqdır. Lakin bu, faktdır və gələcəkdə bu barədə müəyyən elmi araşdırmalar aparmaq üçün əlimizdə tutarlı dəlillər və faktlar mövcuddur.

Beləliklə, Xətai və Miskin Abdaldan başlayan saz və ürfan bağlılığı XX əsrin əvvəllərinə qədər davam edir. Aşıq Alı, Aşıq Ələsgər yaradıcılığında külli miqdarda təsəvvüf qaynaqlarına rast gəlmək olar ki, bu da onların və ümumiyyətlə, folklorumuzun gizli qalan tərəflərini yenidən araşdırmaq üçün bizə əsas verir.

Artıq formalaşmış aşıq ədəbiyyatı janrı, dediyimiz kimi, özündə sufi dünyabaxışını fəal əks etdirirdi. Lakin burada da qalxmalar və enmələr müşahidə olunur. Belə ki, təriqət, mərifət, həqiqət elmlərinin ətrafında cilvələnən Azərbaycan aşıq ədəbiyyatı son dövrlərdə, yəni Səfəvilər hakimiyyətinin süqutundan sonra bir az məna düşkünlüyünə uğramışdır, Fikrimizcə, aşıqlıq, ozanlıq edənlər bu dövrlərdə təkyələrdən, xanəgahlardan ayrı düşmüş, sırf tərki-dünya dərviş həyatından uzaq qalmışlar. Bu da təbii idi. Zamanın təkamülü ilə məqsədli şəkildə, yəni əqidə yaymaq yolunda fəaliyyətdə olan saz və söz sənəti yavaş-yavaş öz yerini sənətkarlığa vermişdir. Dədə Ələsgər ustadnaməsinin birində belə deyir:

**«Ələsgər haqq sözün isbatın verə,**
**Əməlin mələklər yaza dəftərə.**
**Hər yana istərsə, baxanda görə,**
**Təriqətdə bu sevdalı gərəkdir».**

Göründüyü kimi, burada söhbət təriqətdən gedir. Bir az arifanə baxdıqda hiss olunur ki, təriqət məsələsi burada aydın şəkildə qeyd edilir. Yəni, həqiqətdən söz açılmır. Halbuki, Aşıq Ələsgər başqa bir şerində deyir:

**«Ölməyincə bu sevdadan çətin dönəm, usanam.**
**Həqiqətdən dərs almışam, təriqətdən söz qanam».**

Bir daha aydın olur ki, həqiqət və təriqət məsələləri burada ayrılır, hər biri haqqında ayrıca danışılır. Demək, Aşıq Ələsgər bu elmlərə varid imiş. Sadəcə olaraq, zaman onu gizlətməyi icab etmişdir. Bütün bu mətləblər aşıqlığın mühərriki olan sazı da get-gedə təriqət aləmindən ayırmış, onu bir musiqi alətinə çevirərək, çəkisini, məna yükünü xeyli aşağı salmışdır. Təbii ki, bu hal saz havalarına də təsir etmiş, güman ki, çoxlu sayda kəlam havalarını, zikri-ilahiləri aradan aparmışdır. Bunu Cənubi Azərbaycanın Qaradağ mahalında, Əhər, Kəleybər və digər şəhərlərin Əhli-Həqq xanəgahlarında çalınan saz da sübut edir. Eyni quruluşa malik Azərbaycan sazında çalınan ’’Sultan Sərçəm”, ’’Cilovşahi”, ’’Baba Tahir”, ’’Dəftər-Kəlam” və yüzlərlə digər zikri-ilahilər bu gün adı çəkilən zonalarda yerləşən təkyələrin içində səslənir.

Fəqət sazın quruluşuna, kökünə, pərdələrinə xüsusi nəzər etdikdə görürük ki, onda ürfani ünsürlər çoxdur. Məsələn, sol əlin IV barmağıyla tutulan pərdəylə (temperasiyalı sistemlə ”fa” notuna) hər yerdə ”Şah pərdə” deyilir. Bütün saz havalarında bu pərdə ən həlledici, dominant rol oynayır. Məhz “Şah pərdə” sözü yadımıza çox şey salır. Təriqət elmində ”Şah” sözü ’’fəna fillah”, ’’vəhdəti-vücüd”, ’’nəhayət” mənasındadır. Bu pərdəyə Şah Xətainin şəninə ad verilməsi də maraqlı versiya ola bilər.

Ümumiyyətlə, saz çalğısı zamanı sol əlin quruluşu bir kompleksə, qeyri-adi bir məntiqə malikdir. Təməl barmaq olan baş barmaq III simdə işlənir, çalğının ahəngini, əhvalını müəyyən edir. Bu barmaq rəmzi olaraq ’’şəriətdir”,  – yəni başlanğıcdır. Saz havalarının zilə və bəmə doğru hərəkətini müəyyən edən, sol ələ istiqamət verən, kuliminasiyalı inkişafa yol açan II barmaq (şəhadət barmağı) ’’təriqətdir”. Təriqətlə həqiqət arasında bir məna cilvəsi var. Bu “mərifətdir”, – yəni ’’şirinlik”, ”tanımaq”-dır. Bu mənaya III barmaq uyğun gəlir. IV barmaq isə hər zaman ”Şah pərdə”yə meyllidir. Bu ’’həqiqətdir”.

Bütün bunlar, əlbəttə, təxəyyüldən doğan informasiyalardır. Lakin həqiqətən də sazın çalğısı, quruluşu, kökü və ahəngi mütləq bir Həqiqətdən, Elmi-Ilahidən xəbər verir. Bu sadalananların hamısını nəzərə alaraq, bunları daha elmi bir şəklə salmaq, əsaslandırmaq, təsəvvüf ətrafındakı fikirlərimizi daha real və geniş şəkildə təsdiqləyəcəkdir.

**Fəxrəddin BAXŞƏLİYEV,**
**“Dədə Qorqud” jurnalı,**
**2003**



“Miskin Abdal”
Rəssamı: Əməkdar rəssam Cabbar Quliyev

# MİSKİN ABDALIN QISA TƏRCÜMEYİ-HALI

Böyük dövlət və din xadimi, filosof, diplomat, sərkərdə, sufi şair, Azərbaycan aşıq, saz, söz dünyasının ilkin mahir ustadı, müqəddəs ocaq sahibi, maarifçi insan, gözəl müəllim, müdrik el ağsaqqalı, övliya Miskin Abdal (əsl adı Hüseyn Məhəmməd oğludur) təxminən 1430-cu ildə qədim Göyçə mahalının keçmiş Zərgərli, sonralar Sarıyaqub adlanın kəndində "Zərgərli" tayfasının adlı-sanlı nümayəndəsi Cəfər oğlu Məhəmmədin ailəsində doğulmuşdur.

Atasının yaxından qayğısı sayəsində kiçik yaşlarından ərəb və fars dillərinə mükəmməl yiyələnən, cəng oyunlarının, Göyçə ozan-aşıq, qopuz-saz mühitinin sirlərinə yaxından bələd olan Hüseyn Məhəmməd oğlu – Miskin Abdal çox erkən yaşlarından müsəlmançılığın, xüsusilə, Səfəvilərin qızğın himayə etdikləri «şiəlik» dini təriqətinin geniş təbliğinə başlayır. Beləliklə, çox qısa zamanda yüksək ad-san qazanır. Tezliklə Haqqdan ona müqəddəs Ocaq nazil olur.

Seyyid Hüseyn – Miskin Abdal 1500-cü ildə təriqət Şahı Şeyx Heydər oğlu İsmayılla ilk dəfə Göyçədə görüşür. Şimali Azərbaycandan zəfərlə qayıdan İsmayıl söz verdiyi kimi, yenə də Seyyid Hüseynin – Miskin Abdalın qonağı olur, Göyçədəki beş kəndin vergisinin Miskin Abdala çatacağını bildirir. Onun anadan olduğu Zərgərli (Sarıyaqub) kəndini vergidən azad edir. Nəhayət, Miskin Abdalı özü ilə bərabər Təbrizə aparır.

1501-ci il sentyabr ayının 24-də Təbrizdə Şeyx Heydər oğlu İsmayıl şahlıq şərbətini məhz Seyyid Hüseynin – Miskin Abdalın əlindən alıb içir, onun övliya xeyir-duası ilə qırmızı geyinib

şahlıq taxtında əyləşir.

Qızılbaşlar şahının məsləhəti ilə Miskin Abdal 1501-ci ildə Dağıstana dövlət elçisi, səlahiyyətli səfir göndərilir. Müəyyən səbəblər üzündən, o, 1503-cü ildə səfirlikdən geri dönərkən Dağıstan dağlarında ailəsi ilə birlikdə borana düşür. Özü, arvadı Həlimə, böyük oğlu Şadman, qızı Məleykə bu borandan xilas olsalar da, kiçik yaşlı oğlanları Həsən və Əli bu köçün qurbanı olurlar.

Miskin Abdal 1514-cü ilə qədər Azərbaycanla qonşu olan bir sıra dövlətlərdə diplomatik missiyanı ləyaqətlə yerinə yetirir, yüksək səfirlik məharəti göstərir.

1514-cü ildə Maku yaxınlığındakı Çaldıran düzündə Osmanlılarla gedən ağır döyüşlərdə Miskin Abdal bir təcrübəli sərkərdə kimi iştirak edir. Ayrı-ayrı illərdə Şahın bir sıra fərmanları ilə təltif olunan Seyyid Hüseyn –Miskin Abdal 1515-ci ildən sarayda vəzir təyin olunur. O, hətta bir müddət şairlər birliyinə də rəhbərlik edir.

1524-cü ilə Şahın ölümü Miskin Abdalı bərk sarsıdır. O, sarayla biryolluq vidalaşaraq, doğma Göyçəsinə, Zərgərli (Sarıyaqub) kəndinə qayıdır. Burada məktəb açıb, maarifçilik işləri ilə məşğul olur, xalqının övladlarının elm, təhsil alması qayğısına qalır. Təxminən 1535-ci ildə, 105 yaşında dünyasını dəyişir, Zərgərli (Sarıyaqub) kənd qəbristanlığında öz ulularının yanında hörmətlə dəfn olunur. Özündən sonra, Zərgərli (Sarıyaqub) kəndində Miskin Abdalın adı ilə bağlı iki tayfa: ”Şadmanh” – oğul, ”Ocaqlı” – qız tayfaları qalır.

Ulu Göyçə Seyyid Hüseynin – övliya Miskin Abdalın əzəli və əbədi vətənidir.

# SƏFƏVİLƏRİN BÖYÜK ÖVLİYASI – MİSKİN ABDAL

Dünya gözəldir! İnsan övladı dünyaya onun özü kimi əzəli-sonu bilinməyən gözəlliyini sevməyə, sevə-sevə yaşamağa gəlir. Sirli-soraqlı dünya insan kamalının heyrətinə səbəb olur. Bəşər oğlu onu öyrənməyə baş vurur. Gecəli-gündüzlü, gəlimli-gedimli, ölümlü-itimli dünyada o qədər çalışır, o qədər vuruşur ki, heç özü də bilmir, çalışa- çalışa, vuruşa-vuruşa ulu Tanrı tərəfindən qismətində olan, alnına yazılan ömür payı necə başa çatıb. Dünyadan köçəndə də bu dünyada ondan dünyanın özü boyda yaşamaq eşqi qalır. Yer üzünün bu təkrarsız gözəlliyinin içində bir gözəllik daha cazibədar və misilsizdir. Bu, adını təzə-tər güllərin behişt ətrindən, durna gözlü buz bulaqların saflığından, hər yandan üzük qaşı kimi dövrəyə alınan əzəmətli silsilə dağların qüdrətindən, torpağının bərəkətindən, sinəsində göylərin sonsuzluğunu özündə əks etdirən Gölünün əzəmətindən, adamlarının sədaqətindən, qeyrətindən, ən nəhayət, ulu Tanrının eşqindən yaranan, yarandığı gündən zaman keçdikcə göyçəkləşə-göyçəkləşə göyçələşən bir hikmətdən almışdır. Elə buna görə də, adına Göyçə demişlər. Bir qədim rəvayətə görə də, bu adı ilk dəfə İmam Əli dilinə gətirmişdir.

Göyçənin tarixinin qədimliyi və zənginliyi barədə mərhum akademik Yaşar Qarayev 2000-ci ildə Azərbaycan Respublikası Milli Elmlər Akdemiyasının Nizami adına Ədəbiyyat İnstitutunun Elmi Şurasının qərarı ilə çap olunmuş Azərbaycan

folkloru antologiyası 3-cü cild (Göyçə folkloru) kitabında belə yazır: ’’Tarixdə hər şey bizim üçün folklordan, folklor isə Göyçədən başlayır”. Bu zənginliyin içində Göyçənin tarixi şəxsiyyətləri də az olmamışdır.

Hələ çox qədimlərdən əsrarəngiz gözəlliyindən, göyçəkliyindən adı yaranan ulu Göyçə mahalı aləmdə məşhur, böyük dövlət və din xadimi, filosof, diplomat, sərkərdə, Azərbaycan aşıq, saz, söz sənətinin inkişaf etdirilməsində müstəsna xidmətləri olan sufi şair, maarifpərvər insan, gözəl tərbiyəçi-müəllim, müqəddəs ocaq sahibi, müdrik el ağsaqqalı Miskin Abdalın əzəli və əbədi vətənidir. Miskin Abdal əzəl gündən bu torpağın, bu xalqın, bütövlükdə isə, Azərbaycanın şöhrət çələngi, mətanət, qeyrət, paklıq rəmzi olmuşdur. Onun bu şöhrəti öz məcrasına sığmadığından Azərbaycanın sərhədlərini aşaraq yaxın-uzaq ölkələrə yayılmış, onu daha çox məşhurlaşdırmışdır.

Heyrətləndirici bir haldır ki, Miskin Abdal hələ sağlığında ikən əfsanələşmiş, daha doğrusu, bir əbədi qədim əsatirə çevrilmiş, haqqında çoxlu rəvayətlər söylənmiş, adına çoxsaylı yer-yurd, yaşayış məskənləri olmuşdur. Bunların da hər birinin öz yaranma tarixi və səbibi söylənilir. Belə ki, şiəlik dini təriqətinin yayılmasında müstəsna xidmətləri və şücaəti olan Miskin Abdal bu dini ideologiyanın geniş əhali arasında aydınlığı və paklığı ilə qəbul edilməsi üçün el-el, oba-oba, mahal-mahal gəzər, lazım gələrsə, buralarda aylarla, hətta, illərlə qalmalı olurdu. Ona görə də, xalq bu böyük din xadiminə sonsuz hörmət əlaməti olaraq onun təşrif buyurduğu, namaz qıldığı, oçaq çatdığı, xörək yediyi, yatdığı, yaşadığı yerləri müqəddəsləşdirərək, ziyarətgahlara çevirir, ya da onun adını verirdilər. Bun-

lar, əsrlərin sınağında dildən-dilə, ağızdan-ağıza keçərək bu günümüzə, öz əbədi təravəti ilə gəlib çatmışdır.

Qərbi Azərbaycanın Qara Kilsə (indiki Ermənistan Respublikasının Kirovakan rayonu) rayonunun Haydarlı (Heydərli. Deyilənlərə görə bu, Şah İsmayıl Xətainin atası Şeyx Heydərin adı ilə bağlıdır) və Hollavar kəndlərinin sabiq sakinlərinin söylədiklərinə görə, bu iki kənddə və onun ərazisində Miskin Abdalın adı ilə bağlı səkkiz ziyarət – Ocaq yeri vardır. Bunlardan birinin yaranma səbəbi daha maraqlıdır. Deyirlər, Miskin Abdal bu ərazidəki Maymaq dağının başına çıxıbmış. Yəqin ki, belə bir yüksəklikdə bulaq ola bilməzdi. Burada olan bir neçə gənc Miskin Abdala müraciət edirlər ki, bir möcüzə göstərsin. Əks halda onun təbliğ etdiyi dini təriqəti qəbul etməyəcəklər. Bunu eşidən Miskin Abdal üzünü göylərə tutub, dodaqaltı nəsə pıçıldayır və çəliyini bərkdən yerə vurur. Bu vaxt çəlik dəyən yerdən su qaynamağa başlayır. Hətta onun içindəki xırda daşlar da rəngbərəng imiş. Cavanlar Miskin Abdala iman gətirirlər. O gündən həmin bulaq ’’Miskin bulağı” olmaqla bir ziyarətgah yerinə çevrilir. Lakin ötən əsrin sonlarında nankor ermənilər bu bulağı murdarladıqlarından sonra onun suyu quruyur. Qarakilsə rayonunun (Kirovakan) Mollaqışlaq kəndinin ərazisində Cəbrayıl, Şorax və Xamoy dağlarının arasında Şorax dərəsində XVI əsrdən yadigar qalan ’’Miskin Abdal ocağı” da 1988-ci ilin məlum hadisələrinə qədər insanların ümid və inam yeri kimi dini ziyarətgaha çevrilmişdi. Burada hamı Miskin Abdalı öz babası hesab edirdi.

Qərbi Azərbaycanın Dərəçiçək mahalında da buna bənzər bir hadisə olmuşdur. Yerli sakinlər həmin kəndi Miskin Abdalın adı ilə bağlı ’’Miskin” adlandırmışlar. Kənd sakini, hazırda

Bakı şəhərində yaşayan Tapdıq Qurbanov yadında qalan bu hadisəni belə danışır: «Babalarımız danışırdı ki, bir gün kəndə xəbər yayılır ki, Göyçəli Seyyid Miskin Abdal buraya təşrif buyurur. Camaat onu böyük təntənə ilə qarşılayır. Hamı onun təbliğ etdiyi dini təriqətə iman gətirir. Lakin, bir dəstə gənc camaata qoşulmur. Onlar israr edirlər ki, Miskin Abdal bir möcüzə göstərməyincə heç nəyə inanmayacaqlar. Miskin Abdalın göstərişi ilə bir ocaq çatılır və bir qumral quzu gətirilir. O, quzunu qucağına alıb ocağın içinə girir. Ocaq yanıb qurtarır. Ancaq Miskin Abdal və qucağındakı quzu sağ-salamat qalırlar. Bunu görən həmin adamlar tutduqları işdən peşman olub Miskin Abdala iman gətirirlər. Elə həmin gündən yerli sakinlər bu kəndə ’’Miskin” adını verirlər. Lakin sonralar, daha doğrusu, sovet dövründə bu kəndin adı əvvəlcə ’’Qayğı ocağı” və nəhayət M.F.Axundovun adı ilə ’’Axundov” kimi əvəzlənir.

Gədəbəy rayonunyn ərazisində bir oba var. Adına da “Miskinli oba” deyirlər. Yerli sakinlər Miskin Abdalın nə vaxtsa bu obaya köçüb gəldiyini və bir müddət burada yaşadığını ehtimal edirlər.

Qonşu Dağıstan Respublikasındakı Axtı rayonunda bir kənd var, adı da Miskincidir (ləzgi dilində ’’Miskinli”). Beləliklə, həmin kənddə yaşayan və sonralar Azərbaycanın Qusar rayonuna köçüb gələn adamlar deyirlər ki, həmin kənd Dağıstanda yeganə kənddir ki, əhalisi şiədir. Adamların rəngi də yerli adamların rənginə oxşamır. Deyirlər, Miskin Abdal Dağıstanda olarkən azərbaycanlı olan kənd sakinləri onu qonaq dəvət edirlər. Kənd əhalisi onun təbliğ etdiyi şiəlik dini təriqətini hamı tərəfindən bir nəfər kimi qəbul edirlər. Həmin gündən kəndə

’’Miskinli” adını verirlər. Zaman keçdikcə, yerli sakinlər müəyyən hadisələrlə bağlı öz doğma dillərini də unudurlar.

Xalq baxımından adamların bu sevgiləri təbii hesab edilməlidir. Çünki, hamı öz keçmişini belə ağıllı, müdrik, cəngavər, adlı-sanlı adamların adı ilə görmək istəyir.

Miskin Abdala olan çoxsaylı sevginin bənzəri az deyil. Məsələn, Oğuz Xaqanın, Dədə Qorqudun, Əshabi-Kəhf mağarasının, Koroğlunun haqqında nə qədər desən əfsanə, rəvayət və söyləmələr vardır. Bunlar da ayrı-ayrı xalqlar, tayfalar tərəfindən sevilmiş və bu sevgi həmin qəhrəmanlıqların və müqəddəsliklərin yeni-yeni ”vətəni”nin yaranmasına səbəb olmuşdur. İndi Azərbaycana yaxın-uzaq məkanlarda onlarca ’’Koroğlu qalası”, ’’Oğuz Xaqanın”, ’’Dədə Qorqud”un qəbirləri, ’’Əshabi-Kəhf” mağaraları vardır. Həqiqətdə isə onların hamısının bir vətəni var, o da Azərbaycandır.

Əslən Gədəbəy rayonundan olan filologiya elmləri namizədi Yaqub Babayevin imzası ilə 18 aprel 1991-ci ildə ’’Kommunist” qəzetində dərc olunmuş ’’Miskin Abdalın söz gülüstanı” yazısında oxuyuruq: ’’Miskin Abdalın bir müddət indiki Gədəbəy rayonu ərazisində yaşadığını söyləmək olar”. Həqiqəti dərindən dərk edən və hər şeyə yüksək elmi-nöqteyi nəzərdən düzgün baxan alim bu bir cümləsi ilə əsassız, qondarma rəvayətləri, fikirləri rədd etmiş, Miskin Abdalın Gədəbəy rayonu ərazisində doğulub boya-başa çatmağını xəyalına belə gətirməmiş, hətta onun, bəlkə də, bu ərazidə ancaq bir müddət yaşaya bildiyini söyləmişdir. Alim bir daha sübut etmişdir ki, həqiqətin bir üzü vardır.

Bu məsələ ilə bağlı Abbas Mazanov 11 avqust 1989-cu ildə ’’Ədəbiyyat və incəsənət” qəzetinin 32-ci nömrəsində çap olunmuş ’’Sarıyaqubdan başlanan yol” adlı yazısında bu anlaşılmazlığa yeni bir aydınlıq gətirir: ’’Abdalın Miskin təxəllüsünə istinad edərək onun Gədəbəyin ’’Miskinli oba”sından olmasını söyləmək o qədər də inandırıcı ola bilməz. Ona görə ki, Miskin ləqəbli aşıqlar çox olub –Miskin Əsəd, Miskin Əli, hətta erməni aşığı Miskin Bürcü, Miskin ləqəbli gürcü aşığı və başqaları.

Qədim yaşayış məskəni olan Göyçə mahalında vaxtılə sırf azərbaycanlılar yaşamışlar. Burada bir neçə yüz kənd, oba, bir neçə inzibati yaşayış mərkəzləri olmuşdur. Bu qədər ərazinin heç bir yerində Miskin Abdalın adına ikinci bir ziyarətgah yeri, ’’Ocaq” olmamışdır. Hamı Göyçə mahalının Zərgərli (Sarıyaqub) kəndindəki Miskin Abdalın yeganə ”Ocağ”ını tanıyır və ona səcdə edirdi. Bu kənddə olan çoxsaylı tayfa adamlarının heç də hamısı özünü bu gün də Miskin Abdalın törəməsi hesab etməmişdir. Çünki, burada hər şey gün kimi aydın idi, şübhəli heç nə yox idi. Hamı bir nəfər kimi yaxşı bilirdi ki, Miskin Abdal bu kənddə doğulub, özünün də tayfası vardır. 550 ildən çox bir vaxtda onun müqəddəs Ocağı heç bir yerdə yox, məhz doğma Zərgərli (Sarıyaqub) kəndində olmuşdur.

Miskin Abdal müəyyən səbəblər üzündən vaxtında lazımınca tədqiq olunmadığından onun barəsində lüzumsuz mübahisələr, anlaşılmazlıqlar yaranmışdır. Belə ki, səbəbsiz qaranlıq məqamlardan biri də onun mənsub olduğu adı ilə bağlıdır. Artıq hamıya və elmə məlumdur ki, “Miskin” və ’’Abdal” sufi təxəllüsləridir. Onun əsl adı Hüseyndir. Bu təxəllüsləri öz

həqiqi mənasından uzaqlaşdıranlar da az olmadı. Ancaq son elmi araşdırmalar, dəlillər və dürüst sübutlar bütün uydurmaları birdəfəlik rədd etdi.

“Azərbaycan tarixi üzrə qaynaqlar” kitabında göstərilir ki, XV-XVI əsrlərdə ’’abdal”, artıq, “yol və hal adamı”, “dərviş qələndər”, “təriqətə təmənnasız xidmət edən gəzəri sufi” mənasını bildirirdi. Rəfiq Özdəkin ’’Türkün qızıl kitabı”nda isə ’’Abdallar”, “vətənə xidmət edən ağıllı adamlar, rəhbərlər” kimi təsvir edilmişdir. Fuad Köprülü İslam ensiklopediyasında ’’abdal” sözünü belə səciyyələndirir: “Abdal” sufiliyin mərtəbə silsiləsindəki dərəcələrindən biridir. Ən çox yayılmış bir qənaətə görə, qırx olan abdal, övliya mərtəbə silsiləsində beşinci dərəcəni təşkil edir ki, bu da silsilənin zirvəsindədir”. Azərbaycan folkloru antologiyası (Göyçə folkloru) kitabının üçüncü cildində oxuyuruq: “Hər iki sufi mərtəbəni –miskinliyi və abdallığı (ikisini də birdən!) həm şəxsiyyətində, həm də təxəllüsündə hamıdan əvvəl Miskin Abdal birləşdirdi. Həm müridə, həm də pir-aşığa eyni vaxtda çevrildi. Ulu ustad sələfi Əhməd Yasəvi kimi göyçəli Seyyid Hüseyn – Miskin Abdal də əyninə övliya və pür-kamal libası geydi, ayağına dərviş çarığı taxdı, bütün nəfsləri özünün qulu, özünü isə təkcə Tanrının qulu elan etdi. Tək olan dərgahı, bir olan Allaha tapılıb, onu aparan yolu – ürəkdə ilahini və ilahiliyi tərənnüm yolunu tutdu. Hətta təriqət şahına, ’’iqlimin həzrətinə” də dərgahda həmişə ayıq, keşikdə həmişə sayıq, halalı və haqqı xatırlatmaq yolunu tutdu:

**«Şahım, nə yatıbsan, dünya xarabdır,**
**Haqq özü yatmayıb, ayaq üstədir».**

Həmçinin, məşhur Çaldıran döyüşünün bütün türk dünyası miqyasında faciəsi barədə aşağıdakı beyti də Miskin Abdal hamıdan qabaq, Hüseyn Caviddən düz beş yüz il əvvəl söyləyib:

**«Türk əcəmə, Əcəm türkə zülm eyləsə günahdır,**
**İkisi də bir kökdəndir, yaradan da Allahdır».**

Beləliklə, aydın olur ki, ’’Miskin” (yazıq, nisgilli, fağır) və ’’Abdal” (dəli, sərsəri, divanə) təxəllüsləri özünün ilkin – hərfi leksik mənasını itirərək, böyük dini məna kəsb etmiş, daha qüdrətli sözə çevrilmişdir. Bu sözlərdən tarixdə təxəllüs kimi istifadə edənlər də olmuşdur. Belə ki, hələ Miskin Abdaldan xeyli əvvəl yaşamış Yunus İmrə də bu sözlərdən təxəllüs kimi istifadə etmişdir:

**«Miskin Yunis biçarədir,**
**Başdan ayağa yarədir».**

Şah İsmayıl Xətai də ’’Miskin” və ’’Abdal” təxəllüslü şeirlər yazmışdır:

**«Xəstədir Miskin Xətai, bir misali əndəlib,**
**Hüsn bağında vəmali gülizarım gəlmədi».**

və ya:

**’’Mənəm Abdal Xətai Heydər oğlu’’** və sairə.

“Abdal” sözünün digər bir mənası da onun “qeyrət və bahadırlıq“ kimi işlənməsidir. Bu fikir Jozef Tiflisinin “Vaqiati-Mir Veys və Şah Hüseyn” əsərində də aydın göstərilmişdir: ’’Onlar abdal uğanları (abdal əfqanlar) adlandırılan tayfadandırlar. Qeyrətlidirlər və zatlarında bahadırlıq vardır”.

Əhmədağa Əhmədovun ikinci nəşri olan ’’İslam təlimi” кitabında (Bakı, 2001) 251-ci səhifədə göstərilir: ’’Abdal – neçə nəfər möminlərdir ki, yer və asiman onların vücudilə bərqərar olur; onlar İmami-zəman aleyhissəlam yavərlərindəndir ki, biri dünyadan gedəndə, onun yerinə bir nəfər dünyaya gəlib, onu əvəz edir”.

Bundan başqa, Azərbaycanın böyük sufi-hürufi şairi Imaəddin Nəsimi ’’miskin” və ’’abdal” anlayışlarını Rumda (Anadoluda) abdal – dərviş olmasını və Allaha miskin aşiqliyini ifadə etmək üçün şeirlərində bu cür işlətmişdir:

**«Biz ki, Rum içində abdal olmuşuz,**
**Bu cahandan fariqül-bal olmuşuz».**

Yaxud,

**«Zahidin bir barmağın kəssən, dönüb həqdən qaçar,**
**Gör bu miskin aşiqi sərpa soyarlar ağlamaz».**
*(I.Nəsimi. ”Mən bu cahana sığmazam” Bakı, 1991, səh. 7,10)*

Göründüyü kimi, miskinliyin və abdallığın ən uca zirvəsinə yüksələn Seyyid Hüseyn – Miskin Abdal ulu Tanrının əbədi

sevgisinə layiq bir şəxsiyyət olmuşdur.

Bəli, 105 il ömür sürən və Şah İsmayıl Xətainin ölümündən təxminən 10 il sonra dünyasını dəyişən Miskin Abdal 1430-cu ildə qədim Göyçə mahalının Zərgərli, sonralar Sarıyaqub adlanan kəndində ’’Zərgərli” tayfasından olan, yaşadığı dövrdə elinin-obasının, xalqının sayılıb-seçilən adamlarından biri hesab edilən Cəfər oğlu Məhəmmədin ailəsində dünyaya gəlmişdir.

Dövrünün ziyalılarından biri sayılan və elmin qədrini bilən Məhəmməd kişi, balaca Hüseyni kiçik yaşlarından mükəmməl təhsili olan molla yanına oxumağa qoyur. Az vaxtda Hüseyn ərəb və fars dillərinə dərindən yiyələnir, Quranı sərbəst oxuyur, dünya elmlərindən yavaş-yavaş hali olmağa başlayır.

Hüseyn böyüdükcə atası ona daha çox şey öyrətməyə çalışır. O, oğlunun bu dəfə cəng oyunlarına, döyüş qaydalarına yiyələnməyə, at çapmağa, qalxan tutmağa, qılınc vurmağa olan diqqətini artırır. Atanın bu zəhməti də hədər getmir. Hüseyn mahir bir döyüşçü kimi yetişir.

Bunlardan kifayətlənməyən Məhəmməd kişi oğluna Göyçə ozan-aşıq, qopuz-saz sənətinin öyrədilməsi qayğısına da qalır. O, bu məqsədlə Hüseyni Ozan Heydərin şəyirdi olmuş Ozan İbrahimin yanına qoyur. Bu peşəyə olan sonsuz məhəbbəti gənc Hüseynə mahir bir sənətkar kimi yetişməyə imkan verir. O, fitri istedadı və qabiliyyəti ilə ustadını mat qoyur və çox erkən yaşlarından bir şair kimi bədahətən gözəl sözlər, şeirlər qoşmağa başlayır.

Gözəl qopuz çalan və bədahətən şeirlər deyən Hüseynin məharəti haqqında tez bir zamanda Göyçədən uzaqlarda da

gözəl sözlər eşidilməyə başlayır. Sənətində gündən-günə püxtələşən və kamilləşən Hüseyn daxilən rahat deyildi. O, göyçəlilərə məxsus bu qədim el sənəti və sənətkarlığı olan ozan-qopuz dünyasında bir darlıq, çatışmazlıq hiss edir. İlahidən qəlbinə dolan bu hisslər onu rahat buraxmır. Nəhayət, Hüseyn öz istəyinə nail olub rahatlanır. O, qopuza düzəlişlər edərək, dizin üstündən sinəsinə qaldırır. Ürəyə oxşayan və sinədə ürəyin üstünə qaldırılaraq, üzü Ulu Tanrıya tərəf baxan bu yeni ”qopuz”un adını ”saz” qoyur. Onu çala biləni isə aşiq-aşıq adlandırır. Sazın qoluna düzülən yeddi pərdə göylərin yeddi qatını, simləri insanların göylərə yüksələn səsi, sazın simlərini nizam saxlayan birləşdiyi aşıqları isə yerdən-göyə ucalan haqq aşiqləri kimi təsvir edir. Beləliklə, Miskin Abdal ozan-aşıq, qopuz-saz sənətinin və sənətkarlığının yeni bir erasının başlanğıcını qoyur. O, aşıq-saz dünyasının yeni ilkin yaradıcı memarı və müəllifinə çevrildi. Yəni, Göyçədə daha yeni bir musiqi elminin erasına başlandı, bu gözəl və hər zaman sevildikcə sevilən xalq  sənətinin əzəmətli təməli qoyuldu.

Miskin Abdala görə sazı çalmaq istəyən hər bir kəs gərək ona vurğun olsun, aşiq olsun. Yoxsa ondan heç vaxt kamil sənətkar olmaz. Bu deyilənləri Aşıq Ələsgərin 1972-ci ildə çap olunmuş şeirlər kitabının ön sözü səhifələrindəki aşağıdakı cümlələr də təsdiq edir: “Bir sözlə, Göyçə çox qədim zamanlardan aşıq sənətinin beşiyi olmuş, bu sənətin inkişafında çox böyük rol oynamış, bir sıra çox görkəmli ustadlar yetişdirmişdir. 1515-ci ildə Səfəvi dövlətinin xüsusi, rəsmi fərmanına layiq olan Miskin Abdalın şeirləri də bunu sübut etməkdədir”.

Aşıq Ələsgərdən xeyli əvvəl yaşayan Göyçəli Aşıq Musa bir qoşmasında belə deyir:

**«Musa sözlərini söyləyir aşkar,**
**Deyiləm dünyadan naşı, bixəbər,**
**Miskindən başlamış, Abbasa qədər,**
**Cəmi aşıqların kanı məndədir».**

Növrəs İman isə Miskin Abdalı belə səciyyələndirir:

**«Yaxşı tanıyıram Miskin Abdalı,**
**Cəm imiş başında huşu, kamalı».**

Miskin Abdal aşıq-saz sənətinin memarı idisə, aşıq deyildi.

O, əlində saz el-el, oba-oba, oymaq-oymaq gəzərək Qızılbaşların qızğın müdafiə etdikləri şiəlik dini təriqətinin təbliğini genişləndirirdi. Bu da səbəbsiz deyildi. Şah İsmayılın XIII əsrdə yaşamış ulu babası Şeyx Səfiəddin “Səfəviyyə” dini təriqətinin yayılmasında mötəbər adamlara arxalandığından yaxın-uzaq məkanlarda onları soraqlayır, tapır və dostluq edirdi. Bu məqsədlə, o, Göyçə mahalında Zərgərli (Sarıyaqub) kəndinə adam göndərir. ’’Zərgərli” tayfasının ağsaqqalı, elin hörmətini qazanmış Yaqub kişinin bu məsələyə razılığını öyrənir. Yaqub kişi Şeyx Səfiəddinin bu məsləhətinə ürəkdən razılığını bildirir, bu müqəddəs işi canla-başla boynuna götürür və ilk dəfə olaraq tayfası ilə birlikdə bu dini təriqətə iman gətirir. O vaxtdan həmin nəsil bu xeyirxah işi uğurla davam etdirir. Yaqubdan

oğlu İbrahimə, onun oğlu İsmayıla, onun oğlu Əliyə, onun oğlu Cəfərə, onun oğlu Məhəmmədə etibar olunan və böyük inamla davam etdirilən bu müqəddəs iş Seyyid Hüseynin – Miskin Abdalın qüdrəti və gücü ilə öz ali məqamına çatır.

Hüseyn bu çətin və şərəfli işdə boynuna nə qədər ağır bir iş götürdüyünü, onu qarşıda olmazın çətinliklərin gözlədiyini, bir də öz yenilməz iradəsinin əzəmətini, dönməzliyini yaxşı bilirdi. Bu yolda istədiyinə nail olmaq, sufilik mərtəbələrini keçərək ali dərəcəyə çatmaq, nəhayət, Haqqa qovuşmaq amalı ilə işə sidq ürəklə başladı, miskinləşdi, abdallaşdı. Bu miskinliyi və abdallığı bundan sonrakı ömrünün, taleyinin əzəmətinə və qüdrətinə çevirdi. Onun yerə-göyə ürəkdən bağlılığı ulu Tanrının təkliyinə, əbədiliyinə vurğunluğu, müsəlmançılığa olan sonsuz istəyi və məhəbbəti əvəzsiz qalmadı. Göylərdən onun geniş və təmiz qəlbinə bir inam gəldi, müqəddəsliyin payı olan ’’Ocaq” nazil oldu. Seyyid Hüseyn Tanrı Miskininə, Haqqın carçısına çevrildi. O, bu böyük ada, etimada, etibara layiq idi. O, böyük Yaradanın həmişə sevdiyi bəndələrindən biri oldu.

Ürəyində tək və əbədi olan Allahın eşqini yaşadan, mayası halallıqdan, qayəsi paklıqdan yoğrulan Miskin Abdalın həyatında bənzərsiz bir dönüş yaranır. Ocaq nazil olan gündən Miskin Abdalın – Seyyid Hüseynin xoş sorağı daha uzaq məkanlardan eşidilməyə başlayır. Gözəl bir şair olan Miskin Abdal əlində saz diyar-diyar gəzərək, müsəlmançılığı, xüsusilə Səfəvilərin (Şeyx Səfiəddinin adı ilə bağlıdır) qızğın müdafiə etdikləri şiəlik dini təriqətini el məclislərində, böyük şənliklərdə, çoxsaylı yığnaqlarda təbliğ edirdi. Bu fəaliyyətində saz



**Şah İsmayıl Xətai tərəfindən 1515-ci ildə Miskin Abdalın imzalınmış fərman**



**“Miskin Abdal ocağı”ndakı tarixi sənədlərdən biri**

onun canlı bir silahdaşına, yaxın dostuna çevrilmişdi. Onsuz da hamı Miskin Abdalı aşıq kimi yox, gözəl nəğmələr qoşan, şirin sözlü, xoş söhbətli bir sufi şair kimi tanıyırdı.

Çox keçmir, Göyçə bütövlükdə şiəliyi qəbul edir. Bu böyük dini təşəbbüsə qonşu mahallar da qoşulur. Miskin Abdal gəzə-gəzə daha uzaq ellərə, obalara ayaq açır, öz məramını sevdirmək üçün aylarla, illərlə doğma Göyçəsindən uzaq düşür. Seyyid Hüseyn – Miskin Abdal böyük Allahın köməyi ilə hər yerdə sonsuz məhəbbətlə qarşılanır, adamlar onun yaydığı şiəlik dini təriqətini ürəkdən qəbul edir, İslama, müsəlmançılığa daha böyük məhəbbət və hörmət bəsləyirlər, xüsusi itaət göstərirlər.

Bütün ömrünü bu işə bağlayan Miskin Abdal haqqında aşağıdakı fikri söyləmək daha yaxşı olar: İmam Əli şiəliyin ideoloqu, Səfəvilər onun aparıcı gücü idisə, Miskin Abdal bu böyük dini təriqətin ali bayraqdarından birinə çevrilmişdi.

Qüdrətli Yaradanın əli ilə haqqdan-halallıqdan payını alan Miskin Abdal bütün ömrü boyu hər cür vaxtsız faciəli ölümlərə nifrət etmişdir. Buna görə o, həyatında üç dəfə ağır sarsıntı keçirmişdir.

Cavan ikən Sənubər adlı sevdiyi qızla evlənən və bir neçə aydan sonra onun ölümü ilə dəhşətə gələn Miskin Abdal 50 yaşına qədər evlənmir. Bu ağrı-acıları onun ayrı-ayrı şeir misralarında da açıq-aydın görmək olar:

**«Çərxi-gərdiş yarıtmadı dövlətdən, vardan məni,**
**Min bir dərdi-əzab verib ayırdı yardan məni».**

və yaxud:

**«Yazıq könlüm, nə sızlarsan, bülbülə tay olmusan,**
**Haçan yardan yarımısan, sevilib bay olmusan».**
və sair.

50 yaşında Həlimə adlı qızla yenidən evlənən Miskin Abdalın Şadman, Məleykə, Əli və Həsən adında dörd övladı olur. Ömrünün sonuna kimi həmin qadınla yaşayır.

Miskin Abdalı ikinci dəfə Dağıstan dağlarında boranda həlak olan oğlanları Həsənin və Əlinin, üçüncü dəfə Şah İsmayılın – şair Xətainin ölümü sarsıdır. O, bu dəhşətli sarsıntıları ömrü boyu unuda bilmir.

On dörd yaşlı İsmayıl Şimali Azərbaycana yürüş etməyə hazırlaşarkən atabəyləri ona məsləhət görürlər ki, Göyçədən keçsin. Burada bir neçə mühüm amil nəzərə alınırdı. Birincisi, Göyçə bütövlükdə şiə dini təriqətinə xidmət edirdi. İkincisi, burada həmin dini təriqəti hər yana yayan, onun hörmətini qat-qat ucaldan Miskin Abdal kimi bir din xadimi yaşayırdı. Üçüncüsü, Göyçə İsmayılın ən çox sevdiyi sazın-sözün beşiyi idi. Bu sevgi İsmayıla həm ata, həm də ana tərəfdən qismət olmuşdu. Onun ana babası, Ağqoyunlu dövlətinin hökmdarı Uzun Həsən aşıq mahnılarını xüsusilə çox sevirdi. O, bu məqsədlə sarayda 98 aşıq saxlayırdı. Bəzi ehtimallara görə, Uzun Həsənin Göyçədə iqamətgahı var imiş. İsmayılın ata tərəfi də saza-sözə xüsusi hörmət göstərmişdir. Bu sonsuz maraqla qoşun Göy-

çədən keçmək əmrini alır. Göyçənin təbii, bənzərsiz, behişt qoxulu gözəllikləri İsmayılı valeh edir, o, buranın adamlarının istiqanlılığına, qonaqpərvərliyinə heyran qalır.

Bütün Göyçə əhli kimi Miskin Abdal da yeniyetmə İsmayılı və onun adamlarını böyük hörmət və izzətlə qarşılayır. Bu el ağsaqqalının və yüksək hörmətə layiq din xadiminin, müqəddəs ocaq sahibinin ağlı, təmkini, müdrikliyi gələcək Azərbaycan şahının diqqətindən yayınmır. Söz verir ki, zəfərlə qayıdanbaş yenidən Göyçədən keçəcəkdir. İsmayıl həm də bir dost ocağında olduğunu da bilirdi, Miskin Abdalla öz babaları arasında nəsil nəsil davam edən dostluqdan da xəbəri var idi. Bunu ona atabəyləri demişdilər.

Yeniyetmə İsmayılın Göyçədən keçməsi Oqtay Əfəndiyevin ’’Azərbaycan Səfəvilər dövləti”, Əlisa Nicatın “Qızılbaşlar”, Fərman Kərimzadənin ’’Xudafərin körpüsü” və Miskin Abdala olan xüsusi hörməti Əzizə Cəfərzadənin ‘Bakı 1501” və digər yazıçıların tarixi əsərlərində də öz parlaq əksini tapmışdır.

İsmayıl Göyçədən Şimali Azərbaycana doğru yola çıxmazdan əvvəl ’’Miskin Abdal oçağı”nı ziyarət edir, onun xeyir-duasını alır. Qoşun hərəkətə başlayanda durna səsləri eşidilir. İsmayıl göylərə boylanıb durna qatarına baxır. Bu vaxt o, açıq səmada çoxlu ağ lələklər görür. Maraqlanır. Ona bildirirlər ki, hər ilin yazında və payızında Göyçə mahalının üstündən qatar-qatar uçan durnalardan hər biri “Miskin Abdal ocağı”na bir ağ lələk salıb ondan pay alır. Bunu eşidən İsmayıl heyrətə gəlir.

Nəhayət, İsmayıl Şimali Azərbaycana yürüşdən zəfərlə qa-

yıdır. Vəd verdiyi kimi yenə də göyçəlilərin qonağı olur. “Miskin Abdal ocağı”nı yenidən ziyarət edir. Onun göstərişi ilə böyük ustadın anadan olduğu Zərgərli (Sarıyaqub) kəndi Miskin Abdala bir barat kimi bağışlanır. Gələcək Azərbaycan şahı Göyçədəki beş kəndin vergisinin Miskin Abdala çatacağını bildirir. Miskin Abdal isə təriqət Şahına bir saz bağışlayır. İsmayıl bu əvəzsiz hədiyyədən çox xoşhal olur. Böyük sərkərdə gələcək şahlığında belə bir müdrik adama daha çox ehtiyacı olacağını nəzərə alıb Miskin Abdala məsləhət görür ki, onunla Təbrizə getsin. Miskin Abdal İsmayıla razılıq verir və atası Məhəmmədin xeyir-duasını alır. İsmayıl Göyçədən Təbrizə on iki aşıq da götürür. Beləliklə, bu iki adlı-sanlı nəsil arasında illərlə davam edən tarixi dostluq daha da möhkəmlənir, yeni bir yüksəliş mərhələsinə qədəm qoyur.

Bəzi ehtimallara görə, Şeyx Heydərin vəfalı dostları beş yaşlı İsmayılı dayılarının qılıncından xilas edəndən sonra onu Azərbaycanın cənubunda gizlətməyin mümkün olmadığını bilib, daha etibarı yer sayılan Göyçə mahalım seçirlər. Miskin Abdal burada İsmayılın tərbiyəsi ilə məşğul olur, ona farsərəb dillərinin və mühüm elmlərin öyrədilməsini təmin edir. Bir sözlə, Miskin Abdal körpə İsmayılın mürşidinə çevrilir. Onların arasında əsl ata-oğul məhəbbəti yaranır. Bir müddətdən sonra İsmayıl Təbrizə qayıdır. İsmayılın ilk dəfə Göyçədə olarkən söhbət zamanı öz atabəylərinə, müəllimlərinə ’’lələ” deyə müraciət etməsi Zərgərli (Sarıyaqub) kənd əhlinin diqqətindən yayınmır. O gündən başlayaraq kənd adamları özlərindən yaşca böyük olan kişilərə ’’lələ” deyə müraciət edirlər. Beləliklə, bu

söz yerli sakinlərin leksikonuna daxil olur. Əbəs deyil ki, son vaxtlara qədər qonşu kəndlərin adamları Sarıyaqublulara çox zaman ”ay lələ” və yaxud da ’’lələlər” deyə müraciət edirdilər.

1501-ci ildə İsmayıl Təbrizdə məhz övliya Miskin Abdalın əlindən şahlıq şərbətini alıb içir, onun müqəddəs xeyir-duası ilə qırmızı geyinib şahlıq taxtında əyləşir. Özünün hökmdarlıq gücünü Hüseyn Lələbəy, Xadim bəy Xülafə, Məhəmməd Ustaclı, Qəhrəman bəy Qaramanlı və digər dunyagörmüş ağsaqqalların, müdriklərin böyük təmkinliyində, dərin zəkasında, aydın baxışlarında görən Şah İsmayıl bu sırada Miskin Abdal zəkasının böyüklüyünə, zənginliyinə də arxalanırdı. Ona görə də Qızılbaşlar hökmdarının fərmanları ilə Miskin Abdal 1501-1514-cü illərdə Azərbaycanla qonşu olan bir sıra dövlətlərdə yüksək səviyyədə səlahiyyətli səfir, diplomat vəzifələrini icra edir. Səfəvi hökmdarı Şimaldan daha çox təhlükə gözlədiyinə görə söz sərrafı olan Miskin Abdalı ilk dəfə olaraq Dağıstana səlahiyyətli səfir təyin edir. 1501-cü ildən Dağıstanda öz diplomatik vəzifəsini ləyaqətlə yerinə yetirməyə başlayan Miskin Abdal 1503-cü ildə ata-anasının ölüm xəbərini eşidib, Şahın icazəsi ilə ailəsi ilə birlikdə Göyçəyə qayıtmalı olur. Bu vaxt onlar Dağıstan dağlarını keçərkən qəfil borana düşürlər. Onun böyük oğlu Şadman və ikinci uşağı Məleykə sağ qalsalar da, kiçik yaşlı Əlini və Həsəni borandan qurtarmaq mümkün olmur. Övladlarının bu faciəli ölümü böyük ustadı həyatda ikinci dəfə bərk sarsıdır. Bu münasibətlə ’’Dağlar” qoşmasında öz ürək ağrılarını belə izah edir:

**«Nəs illərdən satın aldın nəs günü,**
**Çağırıb dumanı, tökdün çiskini.**
**Gözü yaşlı qoydun Cüda Miskini,**
**Eylə gülə-gülə tamaşa, dağlar».**

Türk səyyahı Övliya Çələbi xatirələrində 1640-1641 və 1646-1648-ci illərdə iki dəfə Azərbaycanda olduğunu, bu gözəl ölkə haqqında zəngin məlumat əldə etdiyini, Dəmirqapı Dərbəndi, onun müqəddəs yerlərini gəzdiyin bildirir və yazır: ’’Orada 40 nəfər görkəmli şəxsin dəfn edildiyi müqəddəs dağ, ’’Qırxlar dağı” adlanır”. Heç şübhəsiz, Miskin Abdalın ’’Məni” rədifli divanisində ’’Qırxlar piri” özü verib dərsimi ümman mənim” – deməklə, Dağıstanda olarkən ’’Qırxlar piri” deyilən yerdə dəfələrlə olduğunu, onu dönə-dönə ziyarət etdiyini və buradan ümmanca dərs aldığını bildirir”.

Miskin Abdalın 1514-cü ildə Maku yaxınlığına Çaldıran düzündə Səfəvilərlə Osmanlılar arasında gedən müharibədə bir təcrübəli sərkərdə kimi iştirak etdiyi və yaralandığı ehtimalını aşağıdakı misraları da gerçəkləşdirir:

**«Qoymayın, Miskin Abdal qəzada həlak olacaq,**
**Ey könül, gəl düş havadan, axırın xak olacaq».**

Habelə, Miskin Abdal Çaldıran müharibəsinə öz münasibətini belə bildirmişdir:

**«İslam bada gedir cəllad əlində**
**Paşam, mürvət eylə, belə kar olmaz».**

Oqtay Əfəndiyevin ''Azərbaycan Səfəvilər dövləti" kitabında göstərilir ki, Səfəvilər dövründə döyüşlərdə şahlarla birlikdə bütün saray əyanları və əşrəfləri də iştirak edirdilər.

Deyirlər, Miskin Abdal iştirak etdiyi bütün döyüşlərdə qoşunun qabağında saz çala-çala gedərmiş. Onun adı ilə bağlı ''Atlandırma" saz havası da bu məqsədlə yaradılmışdır. Başqa bir söyləməyə görə, qətiyyəti ilə şəxsiyyətini əyilməz edən bu, dağ vüqarlı insan hansısa qonşu dövlətdə səfir işləyərkən yerli hökmdarın gözü onun ''Haçadil" adlı atına düşür. Bunu eşidən Miskin Abdal bərk hiddətlənir və dərhal həmin dövlətin səfirliyindən imtina edib Təbrizə qayıdır. Şah onun qeyrətinə heyran qalır.

Qızılbaşlar şahı Miskin Abdalın şəxsiyyətinə böyük hörmət göstərdiyindən onun yaşının çoxluğunu nəzərə alıb, 1515-ci ildən saray işlərinə dəvət edir. 1524-cü ildədək, yəni Şah İsmayılın ölümünədək sarayda işləyən Miskin Abdal əvvəlcə vəzirlərdən biri olmuş, bir müddət isə şairlər birliyinə rəhbərlik etmişdir. Tarixçi O.Əfəndiyevə görə Səfəvilər dövründə vəzir, dövlətdə beşinci vəzifə idi – Şah, vəkil, qurçi başı, əmir, əmir əl-ümarə, vəzir və sədr.

Gülruba Kərimovanın 1999-cu il 23 apreldə ''Xalq qəzeti"ndə çap olunmuş ''Göyçə haqqında düşüncələr" yazısında oxuyuruq: ''Qorqud boylarında dəfələrlə adı səslənən, vəsfi sığallanan, Uzun Həsənin yaylaq yeri olan qədim Göyçədə Şah İsmayılın iqamətgahı vardı. Onun səlahiyyətli səfiri və

vəziri olmuş Miskin Abdala öz əli ilə bağışladığı möhür, əsa və sairlər bu günlərə qədər qorunub saxlanılır”. Fəlsəfə elmləri namizədi Nazim Hüseynov Şah Ismayıl Xətainin fəlsəfi dünyagörüşü mövzusunda elmi iş axtarışında olarkən Miskin Abdalla bağlı dəyərli məlumatlara rast gəldiyini bildirir və Xətainin Miskin Abdalı ən çox sevdiyi yeddi şairdən biri hesab etdiyini, onun bir müddət şairlər birliyinə rəhbər təyin olunduğunu deyir. Bu fikirlər 1993-cu ildə Moskvada rus dilində çap olunmuş ’’Türk aşiq poeziyası” kitabında da öz əksini tapmışdır. Ömrüboyu Miskin Abdala tükənməz hörmət və məhəbbəti olan Xətai onun digər – yüksək ağlı, fitri zəkası, xüsusi bacarığı ilə yanaşı, şairlik qüdrətinə də heyran imiş, onun şeirlərinin çoxusunu əzbərdən bilirmiş. Hətta onların arasında şeir deyişmələri də olub.

Miskin Abdal:

**«Üç şey var ki, bu dünyada yaralı,**
**Biri Aydır, biri Gündür, biri nə?»**

Xətai:

**«Dörd şey vardır ildən-ilə dövr edər,**
**Biri Aydır, biri Gündür, biri qışdır, biri yaz.»**

və sairə.

Miskin Abdalın bir çox möcüzələrinin canlı şahidi olan Şah Xətai 1515-ci ildə onun adına belə bir fərman imzalayır: ”Ey mömin insanlar, Miskin Abdal mötəbər şəxsdir, ona sidq ürəklə inanın, nə mətləbiniz varsa ondan diləyin”.

Xətai və Miskin Abdal poeziyasında, xüsusilə ustadnamələri arasında bir yaxınlıq və doğmalıq vardır.

Qızılbaşlar şahına dərin sevgisini heç vaxt gizlətməyən Miskin Abdal Şahın adına ’’İsmayılı”, atasının adına “Heydəri”, qardaşlarının adına “Sultani”, ’’İrvahami”, şəninə “Şah-sevəni”, ”Şah qalxdı”, ”Şah divani” (”Baş divani”) və başqa saz havalarını qoşmuşdur. Bundan xəbər tutan Osmanlı sultanı Miskin Abdaldan onun adına da bir “Divani” saz havası yaratmasını xahiş edir. Ustad bu xahişə əməl edir. Həmin saz havasının adını ’’Osmanlı divanisi” (’’Ayaq divani”) qoyur. ”Şah qalxdı” saz havasının necə yaranmasını isə Abbas Mazanov belə söyləyir: ’’Deyirlər, bir səhər Şah İsmayıl yuxudan sazın səsinə oyanır. Yeni eşitdiyi bu saz havası özünün əzəməti, gözəlliyi ilə az qala şahın ixtiyarını əlindən alır. Bundan vəcdə gələn hökmdar sazın səsinin sehri altında qapıya yaxınlaşıb, onu astadan açır. Bunu görən Miskin Abdal əlini sazdan ayırıb, dərhal ayağa qalxır. Sazın susması, elə bil, Xətainin üstünə dərd-qəm ələyir. Özündən biixtiyar deyir:

– Ey sazın, sözün Şahı, hökmdarı, mənə rəhmin gəlsin. Sazı dilləndir. Həmin havanı çalmaqda davam elə. Axı, o sehrli saz havasının səsinə Şah qalxdı. Xətainin Miskin Abdala ’’Şahim”, ’’sazın-sözün hökmdarı” deməsi onun sənətinin əlçatmaz ucalığından xəbər verir. Elə, o vaxtdan da həmin saz havasının adı ”Şah qalxdı” qalır.

Əsl kişilik üçün din, namus, vətən, millət və qeyrət deyən Xətai sazı belə təsəvvür edirdi:

**«Bir gün ələ almaz oldum mən sazım,
Ərşə dirək-dirək çıxdı avazım,
Dörd şey var ki, bir qarındaşa lazım:
Bir elm, bir kəlam, bir nəfəs, bir saz».**

İndiyədək aşıqlar və tədqiqatçılar tərəfindən Miskin Abdala məxsus iyirmidən çox saz havası müəyyənləşmişdir. Ancaq onların bir hissəsi çalınmır. Bəziləri, bu gün çalınmayan bu saz havalarının zaman keçdikcə unudulduğunu bildirir. Ancaq tanınmış aşıq Hacı Bayramov başqa cür fikirləşir. O, Miskin Abdala məxsus saz havalarının heç birinin unudulmadığını, bir hissəsinin, ancaq, sadəcə olaraq, böyük vaxt, zaman için-də dolaşığa düşdüyünü, daha doğrusu, adının dəyişdirildiyi ehtimalına daha çox üstünlük verir. O inanmır ki, ”Kərəm”in, ”Koroğlu”nun adına (7-9) bu qədər saz havası olsun. Göyçə-nin Daşkənd kəndindən olan və aşıq sənətinə yaxından bələd olan Ərzuman Əliyev də öz həmkəndlisinin dediklərini birmə-nalı şəkildə təsdiq edir.

Miskin Abdal haqqında rəvayətlər qədərincədir. Daha çox yayılmış belə rəvayətlərin birində deyilir ki, Miskin Abdalın ocağına qeybdən marallar sağına gələrmiş. Arvadı bir gün ocaqda bişən maral südünün qan kəsdiyini görüb, tez bunu ərinə xəbər verir. Vəziyyəti belə görən Miskin Abdalın hirsin-dən əlindəki çəlik burum-burum olur. Qəzəblə:

– ’’Yəqin, oğlum Şadman adam öldürdü” – deyib, çəliyini hirslə yerə vurur.

Bu vaxt zəlzələ baş verir. Çox keçmir, Şadman gəlib çıxır. Məlum olur ki, o, gecə atasının ’’Sarı yer” yaylağındakı mal-qarasına, ilxısına basqın edən quldurların bir neçəsini öldürübmüş. Bunu eşidən Miskin Abdal hirsli-hirsli ocaqdan bir höyüş kösöv çəkib, oğluna atır. Burada yeni bir möcüzə baş verir: Ulu Tanrı günahsız Şadmanı atasının qəzəbindən qoruyur; ağac Şadmana çatmamış yerə sancılıb qol-budaq atıb, yanıq bir armud ağacına çevrilir. Bunu görən ata oğlunu bağışlayır.

1524-cü ildə Şah İsmayılın – şair Xətainin ölümü Miskin Abdalı üçüncü dəfə ağır sarsıdır. O, bu işdən çox kədərlənir və biryolluq saraydan üz döndərib ata-baba yurdu olan doğma Göyçəsinə, Zərgərli (Sarıyaqub) kəndinə qayıdır. Burada ilk dəfə olaraq məktəb açıb, körpə uşaqların maariflənməsi qayğısına qalır, onların sevimli müəllimi olur. Bundan sonra, Göyçə mahalının digər yerlərində də məktəblər açılır, uşaqlara elm, savad öyrədilir.

Miskin Abdal Şah Xətaiyə olan məhəbbətini istər onun sağlığında, istərsə də, ölümündən sonra öz şeirlərində «mürşüdüm» deyə, tez-tez dilə gətirmişdir:

**«Dərviş gərək bu meydanda qurban olsun baş-başa,**
**Mürşüdümdən üzüm dönməz, dünya gəlsə baş-başa.»;**

**«Canım qoydum Mürşüdümün yolunda**
**Sərgərdan qalmışam Urum elində.»;**

**«İqlimin şahıydı Həzrət Süleyman,**
**Ədalətə pənah idi Nuşirəvan,**
**Şeyx oğlu İsmayıl, o, cənnət məkan,**
**Düşməz ələ, bir yadigardı getdi.»;**

**«Mən bu bağa girərəmmi,**
**Gül dəstəsin hörərəmmi,**
**Bir də, ya Rəbb, görərəmmi,**
**Öz Mürşidi–Sultanımı?!»**

və sairə və ilaxır.

Miskin Abdal ölümündən qabaq Şadmanı çağırıb deyir: ’’Oğlum, bil və agah ol, dünyada Ulu Yaradandan başqa heç nə əbədi deyil. Mən öləndən sonra bütün varım, mülküm, odum-ocağım, binim-bərəkətim, yurdum-yuvam sənin olsun. Qız da övladdır. Həm də qız uşağı kəsik olar, gözü həmişə ata evində olar. Bu evdən onun da payı qisməti var. Məsləhət görürəm ki, mən öləndən sonra adıma olan müqəddəs ”ocağ”ı ona ata payı kimi verəsən. Qoy ömrü boyu dolansın, bir tikə çörəyə möhtac qalmasın. Çünki, günahın olsa da, olmasa da, əlin insan qanına batıb. Buna görə ”ocağ”ın qızımda qalmasını lazım bilirəm. Allahın buyurduğu belədir”.

Miskin Abdal təxminən 1535-ci ildə, 105 yaşında haqq dünyasına qovuşur. Zərgərli (Sarıyaqub) kənd qəbristanlığında babalarının yanında hörmətlə dəfn olunur. Şadman atasının vəsiyyətinə əməl edir. ”Ocağ”ı bacısı Məleykəyə verir. Göyçənin Daşkənd kəndindən olan tanınmış aşıq Hacı Bayramov bu

barədə belə deyir: ”Ər evinə ata payını aparan Məleykə sabah qalxıb görür ki, ’’Ocaq” yerində yoxdur, yəni ata evinə qayıdıb. O gedib ”ocağ”ı yenidən gətirir. Bu hal bir neçə dəfə təkrar olunur. Axırda Məleykə ağlaya-ağlaya Şadmana deyir: ”Ay qardaş, axı, mən hansı günahın sahibiyəm ki, atamın ”Ocağ”ı bizdə durmur”. Şadman bacısına ürək-dirək verib, ”Ocağ”ı yenidən geri qaytarır. Həmin gecə yuxuda atası ona tapşırır ki, harmadakı əsamı ”Ocağ”a qoy, bir daha geri qayıtmayacaq. Elə də olur.

Məmməd Aslanın 30 noyabr 1974-cü ildə ’’Ədəbiyyat və incəsənət” qəzetində dərc olunmuş ’’Miskinlərin ən məğruru” yazısında “Miskin Abdal ocağı”nın ağbirçəyi 70 yaşlı Əsmətel nənənin öz dili, öz ləhcəsi ilə söylədikləri: “Miskin Abdalın yadigarlarını qız nəslindən kim isə qoruyur. Dünyadan gethagetdə nəslindən ağlı kəsən bir qız uşağına tapşırır. O da baba evinə gəlib ömrü boyu ziyarətgahlıq şeylərin qayğısına qalır”. Deyilənlərə görə, Miskin Abdal qızını öz tayfasından olan əmisi oğluna ərə veribmiş.

Beləliklə, Miskin Abdal dünyasını dəyişəndən sonra anadan olduğu Zərgərli (Sarıyaqub) kəndində onun adı ilə bağlı iki tayfa: “Şadmanlı” – oğul və “Ocağlı” – qız tayfaları yaranır. Elm adamları, ziyalılar, təcrübəli tədqiqatçılar “Miskin” və “Şadman” adları arasında bir məntiqi doğmalıq olduğunu deyirlər.

Müqəddəs və böyük şəxsiyyət, qüdrətli insan olan Miskin Abdalın yaradıcılığı zəngin və qiymətlidir. Çoxillik elmi araşdırmalardan və geniş təhqiqatlardan sonra Miskin Abdalın yaratdığı iyirmidən çox saz havası, qoşma, gəraylı, təcnis, divani, ustadnamə, deyişmə, bayatı, mədhiyyə, mərsiyyə və digər janrlarda xeyli şeiri, Şeyx Heydərin övladlarının taleyinə həsr

etdiyi ’’Aslan Şah və İbrahim” dastanı, ’’Yetim Hüseyn” dastanı, habelə onun şeirləri əsasında aşıqlar tərəfindən yaradılmış ’’Miskin Abdal və Sənubər” adlı məhəbbət və ’’Miskin Abdal və Şah İsmayıl” adlı tarixi dastan müəyyənləşdirilmişdir. Yəqin ki, bunlar Miskin Abdal yaradıcılığının bir hissəsidir.

Şeirlərində heç vaxt gözəlliyin tərənnümçüsü olmayan Miskin Abdal yaşadığı dövrdən, zəmanədən də gileyli imiş:

**«Şahım, nə yatıbsan, dünya xarabdır,**
**Haqq özü yatmayıb, ayaq üstədir»**

*və yaxud:*

**«Abdal, bu sözləri qanana söylə,**
**Tapsan bir ədalət divana söylə».**

Tanınmış araşdırıcılar birmənalı şəkildə etiraf edirlər ki, Miskin Abdalın yaradıcılığı özündən sonrakı görkəmli şairlərin və aşıqların fəaliyyətində xüsusi rol oynamışdır. Təkcə onu demək kifayətdir ki, böyük ustadın ’’Dağlar” qoşması əsasında başqa şairlər tərəfindən onlarca ’’Dağlar” şeiri yaranmışdır:

Miskin Abdalda:

**«Qüdrətdən çəkilmiş baş-başa dağlar»,**

Aşıq Ələsgərdə:

**«Qüdrətdən səngərli, qalalı dağlar» və sair.**

Başqa bir şeirində Miskin Abdal deyir:

**«Aşıq, kəşt eyləyib, ağır elləri,**
**El içində namus, arı unutma.**
**Hər yanı gəz, təmiz saxla adını,**
**Dost yanında etibarı unutma.»**

Asıq Ələsgərdə:

**«Aşıq olub, tərki-vətən olanın,**
**Əzəl başdan pür kamalı gərəkdir.**
**Oturub, durmaqda ədəbin bilə,**
**Mərifət elmindən dolu gərəkdir» və sairə.**

Bu deyimləri tanınmış folklorçu, professor Sədnik Paşayev də özünün 1985-ci ildə “Ulduz” jurnalının 7-ci nömrəsində çıxan “Miskin Abdal” yazısında daha geniş şərh etmişdir.

1970-ci illərin əvvəllərində Azərbaycan Yazıçılar İttifaqı idarə heyətinin sədri, yazıçı Mirzə İbrahimov böyük ustadın:

**«Qaşların qandadır-qanda,**
**Kirpiyin sandadır-sanda,**
**Hərə bir yandadır-yanda**
**Ağlama, yarım, ağlama.»**

misralarını təşbeh gətirərək, böyük ustadı belə səciyyələndirmişdir: “Bu, ədəbiyyatda Miskin Abdal üslubudur. Onun şeirlərindən bəhrələnən şairlər və aşıqlar çox olmuşdur. Xüsusilə, Q.B.Zakirin yaradıcılığına Miskin Abdalın dini mövzuda olan



**Qədim Göyçə mahalında Basarkeçər rayonunun Sarı Yaqub kəndində "Miskin Abdal ocağı" olan evin ön divarındakı yazılı daş (foto 1986).**

şeirləri güclü təsir göstərmişdir. Miskin Abdal böyük şəxsiyyətdir, dühadır. O, təkcə qədim Göyçə mahalının yox, habelə Azərbayan adlı bir dünyanın fəxridir. Lakin zəmanə onu müvəqqəti olaraq unutdurub. Ancaq vaxt gələcək, Miskin Abdal öz adı, öz böyüklüyü ilə tanınacaq. İnanın, o gün gələcək!".

Tarixdə taleyinə dəfələrlə qaçqınlıq qismət olan (indi ''Ocaq" Goranboy rayonunun Qaradağlı kəndindədir) ''Miskin Abdal ocağı" beş yüz ildən çoxdur ki, mömin, qəlbi təmiz, xeyirxah adamların ümid, inam, imdad yeri olmuşdur. Beş yüz ildən

çoxdur, Allahı bir bilənlər onun paklığından, ucalığından və müqəddəsliyindən dərs alır, haqqa sitayiş edirlər. Bu, ulu Tanrı yanında Miskin Abdal ucalığına aydın və mənalı yolun əbədiliyidir. 574 (beş yüz yetmiş dörd) il bundan əvvəl, Zərgərli (Sarıyaqub) kəndində dünyaya göz açan Miskin Abdal – Göyçədən doğan bu Günəş, öz əbədi ziyası, paklığı, təmizliyi ilə əsrlərin qaranlıqlarını, bir də onu qəlbən sevənlərin geniş ürəyinin dərinliklərini işıqlandırmaqdadır.

Bu, böyük şəxsiyyət təkcə ulu Göyçənin, qədim Azərbaycanın yox, həm də sirli-soraqlı dünyamızın fəxridir. Bu adla həmişə, hər zaman, hər yerdə iftixarla danışmağa, ürəkdən fəxr etməyə dəyər!

***Tofiq HÜSEYNZADƏ***

# MİSKİN ABDALIN SƏNƏT DÜNYASI

15-ci yüzilliyin sonunda və 16-cı yüzilliyin əvvəllərində Azərbaycanda ana dilli ədəbiyyat, xalq poeziyası, aşıq şeiri və dastan ənənələri yeni bir mərhələyə daxil oldu. Səfəvilərin hakimiyyətə gəlməsi ilə milli-mənəvi dəyərlərə artan güclü meyl xalq ədəbiyyatına və aşıq yaradıcılığına xüsusilə ciddi təkan verdi. Miskin Abdalın böyüyüb ərsəyə çatdığı Göyçə mahalı ozan və aşıq sənətinin çox qədim məskənlərindən olub, oğuz boylarının səltənətlərindən sayılırdı. Məhz buna görə də, Göyçə diyarında aşıq sənəti üçün münbit bir mühit vardı. Orta əsrlərdə də Göyçə Yaxın Şərqdə mədəniyyətin yüksək zirvəyə qalxdığı Bağdad, Şam, Xorasan, İsfahan, Təbriz, İrəvan, Naxçıvan, Gəncə və başra şəhərlərlə əlaqə saxlayıb, mötəbər adamlar bu şəhərləri ziyarət edir, təhsil ocaqlarında ərəb və fars dillərini öyrənir, islami biliklərini zənginləşdirir, mütərəqqi təriqətlərdən təlimlənirdilər. Bu da Göyçədə dini təriqətlərin geniş yayılmasına səbəb olurdu. Orta əsrlərin dini və dünyəvi biliklərinə bələd olan mötəbər tayfalarından biri Miskin Abdalın mənsub olduğu ’’Zərgərli” tayfasının Yaqublu nəsli idi. Atası Məhəmməd Cəfər oğlu el arasında sayılıb-seçilən kişilərdən, böyük hörmət, izzət sahibi kimi tanınan sufi müridlərindən biri idi. Hüseyn bu soyun çox möhtərəm bir ailəsində təxminən 1430-cu illərdə doğulmuşdu. Ulu babaları daima Səfəvilərlə

yaxın əlaqədə olmuş, bu əlaqələr Hüseynin ərəb-fars və ana dilində şərq mədəniyyətinə, ədəbiyyatına, incəsənətinə, islam etikasına, şəriət və təriqət biliklərinə, xalq poeziyasına dərindən bələd olmasına imkan yaratmışdır. Sufi təriqətini dərindən mənimsəyən Hüseyn sonralar bu təriqətin müridi kimi tanındı və ''Miskin Abdal" təxəllüsünü qəbul etdi.

Məlumdur ki, ''miskin" sözü müxtəlif təriqət məqamlarında öz leksik mənasını dəyişərək, süfi simvolikası ilə bağlı yeni mənalar qazanmışdı. Sufi biliklərinə və dünyagörüşünə mənsub olan sənətkarların əksəriyyəti ''miskin", ''abdal", "qul", ''xəstə", ''şikəstə" sözlərindən təxəllüs kimi istifadə etmişlər.

Miskin Abdaldan xeyli əvvəllər yaşamış Yunis Əmrə də bəzi şeirlərində ''miskin" sözünü təxəllüs kimi işlətmişdir. Şah İsmayıl Xətainin də çox sevdiyi və dönə-dönə üz tutduğu ədəbi təxəllüslərindən biri məhz ''Miskin" kəlməsi olmuşdu:

**«Xəstədir Miskin Xətai bir misalı əndəlib,**
**Hüsn bağında vəmali gülizarım gəlmədi».**

Dünyanın bütün nemətlərindən könüllü imtina edən, ömrü boyu daxili-mənəvi dünyasını saflaşdırmaq eşqi ilə çırpınan, öz ötəri istək və ehtiraslarını boğaraq mənəvi kamilliyə, ilahi paklığa can atan sufinin ''miskin" sözünə sığınması, "qul", ''xəstə", ''şikəstə" kəlmələrini özünə rəva görməsi Haqqa qovuşmaq arzusundan irəli gəlirdi.

Şübhəsiz, təriqət şairlərinin xalq arasındakı böyük şöhrəti

“miskin” sözünün leksik mənasım arxa plana keçirərək, bu ifadənin yeni rəmzi məna daşımasını təmin etmiş, onu spesifik dini-fəlsəfi çərçivədə sənət və sənətkar anlayışlarının sinoniminə çevirmişdir.

Hüseyn mənsub olduğu təriqətin əzablı yollarında yorulmaq, usanmaq bilmədən ’’abdallıq”, ’’babalıq”, ’’dədəlik”, ’’ləlılik” mərtəbələrini keçərək, ən uca sufi məqamına, pir mərtəbəsinə qədər şərəfli bir ömür yolu keçmişdir. Süfiliyin ən ağrılı, əzablı, çətin mərhələsi “abdal”lıq olduğundan Hüseyn sufi miskinliyi ilə abdallıq mərtəbəsini qovuşdurub, bu adla yaşamağı özü üçün böyük şərəf hesab edirdi.

Beləliklə, Miskin Abdal təxəllüsü ilə Hüseyn qədim Göyçə mahalında və ona qonşu olan diyarlarda sufi təriqətinin nüfuzlu müridi və həm də sinədəftər bir saz şairi kimi hörmət və şöhrət qazanmışdı. Əlbəttə, el arasında müqəddəs pir – ’’ocaq” sahibi kimi Miskinli soyuna böyük etiqad və ehtiram göstərilirdi. Xətainin 1500-ci ildə Göyçəyə bəlli səfəri və Miskin Abdal tərəfindən yüksək qonaqpərvərliklə qarşılanması onun nüfuzunu daha da artırmışdı.

Kiçik bir ordu ilə Şah dağının ətəyində hörmət və ehtiramla qarşılanan Xətai Miskin Abdalın nəzakət, nəcabət sahibi olmasından, yüksək kamal, ləyaqət və mərifətindən, şeir-sənət ustalığından xüsusi zövq almış və Göyçə camaatı qarşısında belə bir bəyannamə imzalamışdır:

”Ey mömin insanlar, Miskin Abdal mötəbər şəxsdir, ona sidq ürəklə inanın, nə mətləbiniz varsa ondan diləyin”. Gələcəyin şahının və təriqət hamisinin Miskin Abdal haqqında belə bir

bəyannaməsi insanların bu pirə inamını bir daha artırır.

Göyçənin gözəlliyinə məftun olan Xətai səfərdən qayıdarkən yenə Göyçədən keçəcəyini, bu gözəl diyarla bir də görüşəcəyini vəd edir. Həqiqətən də Şirvandan dönərkən o, yolunu yenə Göyçədən salır, Göyçə mahalı ilə Göyçənin sazlı-sözlü dünyası ilə daha yaxından tanış olur. Miskin Abdal isə Xətaiyə Göyçə saz ustalarının xüsusi zövqlə hazırladığı bir saz da bağışlayır. Bu tarixi görüşdə Xətai Miskin Abdalı Təbrizə dəvət etmiş, o da sərkərdənin bu dəvətini məmnuniyyətlə qəbul edərək, Təbrizə getmiş və uzun illər sarayda fəaliyyət göstərmişdir.

Miskin Abdal sarayda xüsusi hörmət və nüfuz sahibi olmuş, hətta bir müddət Xətainin yaratdığı şairlər məclisinə rəhbərlik etmişdir.

O, sarayın ədəbi məclislərində iştirak etməklə yanaşı, Bağdadda, Şamda, Dağıstanda, Azərbaycanla qonşu bəzi vilayətlərdə Şah İsmayıl dövlətinin tapşırığı ilə bir sıra siyasi missiyaları həyata keçirmişdir. Bu vəzifələri həyata keçirərkən yüksək diplomatik məharət göstərdiyinə görə şahın xüsusi fərmanı ilə doğulduğu Zərgərli kəndi ona bağışlanmış və ətrafdakı beş kəndin vergisi də onun üçün ayrılmışdır.

Hər iki sənəd Miskin Abdal ocağının varisləri tərəfindən qorunub saxlanmış, hətta 1820-ci ildə Göyçənin Çaxırlı kəndinin kəndxudası tərəfindən bir daha yenidən rəsmən təsdiq edilmişdir.

Miskin Abdal Dağıstanda şahın ona tapşırdığı diplomatik missiyasını yerinə yetirərkən ata-anasının ölümündən xəbər

tutur. Şahın icazəsi ilə ailəsini də götürüb Göyçəyə yola düşür. Qış zamanı Dağıstan dağlarında borana düşən Miskin Abdal iki oğlunu itirir. Gözü yaşlı qüdrətli sufi mürşidi boranlı dağlara üz tutub, dərin daxili kədərini ''Dağlar" rədifli şeirində belə ifadə edir:

**«Gözü yaşlı qoydun Cüda Miskini,**
**Eylə gülə-gülə tamaşa, dağlar».**

Miskin Abdal sarayla əlaqələrini Şah İsmayılın vəfatına qədər kəsməmiş, həm şairlər məclisində, həm də qonşu vilayətlərlə diplomatik əlaqələrin tənzimlənməsində yaxından iştirak etmişdir. Xətainin vəfatından sonra Miskin Abdal Göyçə mahalına – doğulduğu Sarıyaqub kəndinə dönmüş, müqəddəs ocağa piranəlik edib, 105 il yaşamış və 1535-ci ildə dünyasını dəyişmişdir. O, ''Qocaldım" şeirində yaşının yüzü ötdüyünə aydınca işarə edir:

**«Yüzü keçib, silkələyir vaxt məni,**
**Çoxda kı, mən pirəm, nuram, qocaldım».**

Miskin Abdalın şeirləri və haqqında ağızlarda gəzən əfsanələr onun Səfəvi dövlətində böyük hörmət və nüfuza malik olmasından, dövrünün məşhur təriqətlərinə bələdliyindən, həm də onun bir sufi mürşidi kimi gördüyü böyük işlərdən xəbər verməkdədir. Bu şeirlər, əfsanələr, rəvayətlər və sonralar haqqında yaranan dastanlar və dastan fraqmentləri 500 ildir ki, ağızlarda dolaşa-dolaşa yaşaya bilmiş, bəzən mifik don geymiş, əfsanəvi, əsatiri çalarlar qazanmışdır. Onun ilham və

kamal sahibi bir şəxsiyyət olduğunu hələ 1920-ci illərdə Növrəs İman ’’Gəlib-gedib” rədifli qoşmasında belə xatırlamışdır:

**«Yaxşı tanıyıram Miskin Abdalı,**
**Cəm imiş başında huşu, kamalı».**

Uzun əsrlər yazıya alınmadan aşıqların və aşıqsevərlərin sazında, sözündə yaşayan Miskin Abdal şeiri və dastanları yalnız son on-on beş ildə mətbuatda çıxmağa başlamışdır. Əldə edilmiş və çap olunmuş şeirləri göstərir ki, Miskin Abdal öz zamanında sadə, xəlqi dilli, heca vəznli şeirin kamil nümunələrini yaratmışdır. Bu şeirlər forma baxımından zəngin olduğu kimi, məzmun və mündəricə baxımından da dərin ideya-bədii mündəricəyə malikdir. Orta yüzillərin ədəbi ənənəsindən gələn didaktik xeyir və şər, öyüd-nəsihət motivləri, mənəvi-əxlaqi-etik dəyərlər, insan kamilliyinin və gözəlliyinin vəsfi, təriqət, yol-ərkan bütövlüyü, qürbətdə nostalgiya, yurd, el-oba həsrəti, dünyanın vəfasızlığından və qocalıqdan şikayət bu şeirlərdə Miskin Abdal üslubunu, onun məna və məzmun gözəlliyini biçimləmiş olur. Həmçinin, islam dünyagörüşü, fəlsəfəsi, təriqəti, əxlaqı ilə bağlı sufi-hürufi ideallar Miskin Abdalın həyat amalı olmuş və şeirlərinin ruhuna hopmuşdur. ’’Tapınmışam” gəraylısında şairin bu məramı çox aydın, olduqca poetik bir dillə öz ifadəsini tapmışdır:

**«Anadan pür-kamal olub,**
**Şəriətə tapınmışam.**
**Din yolunda abdal olub,**
**Təriqətə tapınmışam».**

**Miskin günüm gəlməz saya,**
**Varlığımdır ismət, həya**
**Qulluq edib tək Xudaya**
**Mərifətə tapınmışam.**

**Miskin Abdal Tanrı qulu,**
**Qəlbindədir Haqqın yolu.**
**Ululardan daha ulu**
**Həqiqətə tapınmışam».**

Ən ali mənəvi məqama ucalmağa, şəriət, təriqət, mərifət, həqiqət mərtəbələrindən keçib, Haqqa qovuşmağa can atan bu əqidə sahibi sufi təriqətinin əsl təbliğatçısı və müridi idi. Ən abstrakt, mistik təsəvvüf postulatlarını o, el müdrikliyi ilə qeyri-adi bir sənətkarlıqla birləşdirə bilirdi. Sona qədər təbiətin, ’’Göyçə” adlı ilahi, müqəddəs stixiyanın təbii, fitri övladı olaraq qalsa da, o, həm də kamala dolduğu ilk gündən özünü pür-kamal sahibi kimi dərk etmiş, təriqət, məslək yolunda miskin həyat keçirib, ancaq və ancaq mərifətə tapınmış, özünü Tanrının qulu hesab edərək, mənən Onun övladı səviyyəsinə yüksəlmiş, Haqqa, həqiqətə qovuşmuşdur. Miskin Abdal şeirində hər şey – insan, təbiət, dağlar, gözəllər hamısı həm də mənəvi, məcazi məna daşıyır, spesifik sufi simvolika ilə aşılanır. İnsan oğluna üz tutan ustad öz ustadnamələrində pisliyin, namərdliyin, naqisliyin acı nəticələrini cəmiyyətə xatırladır, insanı bu hikmətdən, dərslərdən ibrət almağa çağırır:

**«İnsan oğlu, qeybət etdin yoldaşdan,**
**Kəsdin haqq salamı, harası qaldı?**

**Söz yetişdi sahibinə, utandın,**
**Axır, sənə üzün qarası qaldı.**

**Pislikdən nə çıxar, söylə, ay insan,**
**Çıxmaz yaddan, yüz il keçsə aradan,**
**Deyək ki, bir insan çıxdı sıradan,**
**Kimə zər-zibası, xarası qaldı?**

**Miskin Abdal, bəsdir daha bu qədər,**
**Bülbül nəğmə deyər, bayquşlar ötər.**
**Xəncərdən, bıçaqdan, qılıncdan betər,**
**Sinəmdə pis sözün yarası qaldı».**

Atalar bu sözü, elə bil, Abdalın bu misrasından əxz eləyib, deyib: ’’Xəncər yarası sağalar, söz yarası sağalmaz”.

Bəlkə də, ataların bu sözünün də Abdalın əxlaqına və əməlinə dəxli var: ”Bu gün atına gözü düşən, sabah da arvadına göz tikəcək”. Beləsinin ya cavabını ver, ya da ondan uzaqlaş. Miskin Abdalın haqqında yaddaşlarda qalan rəvayətlərin birində deyilir ki, Dağıstanda bir xanın Miskin Abdalın çox yaraşıqlı cins atına gözü düşür. Atın ona bağışlanmasını istəyir. Miskin Abdal xanın bu sözündən inciyib, Təbrizə qayıdır.

Çiyninə müqəddəs saz götürüb ağır elləri oba-oba gəzən bu böyük sufi mürşüdinin başlıca məramı haqqın, düzlüyün, təmizliyin, halallığın, namus-arın yolunu gözləmək, insanlara yardımçı olmaq idi:

**«Aşıq, gəşt eyləyib ağır elləri,**
**El içində namus-arı unutma.**

**Hər yanı gəz, təmiz saxla adını,**
**Dost yanında etibarı unutma.**

**Halal mala haram qatmaq nə lazım?**
**Hədər yerə kaman atmaq nə lazım?**
**Hər yetənə yalan satmaq nə lazım?**
**Əhd-peymanı, düz ilqarı unutma».**

Haqqın dərgahına ucalmaq üçün keşməkeşli yollar keçən, övliya, pir məqamına ucalan bu böyük sənətkar insanlara tez-tez ömür yolunun sonunu xatırladır. Xatırladır ki, sən bu dünyanın qonağısan, murada da bu dünyada yetməlisən. Ona görə də ”yaş torpağı, dar məzarı unutma”. Bu həqiqəti görməyən, duymayan, yaşamayan insan heç vaxt düz yolda ola ilməz. Həqiqət carçısı bu məqamda özünü, kimliyini nişan verir. Xudanın ona verdiyi payı da etiraf eləyir:

**«Xudam doğulandan verib payımı,**
**Anadan olalı pakam, halalam.**
**Mən yaxşı bilirəm haqqı-sayımı,**
**Müxənnət görəndə dinmərəm, lalam...**

**Üzümdən Allahın salamı yağır,**
**Haqqın tərəfiyəm, deyiləm fağır.**
**Ulu Yaradana getməsin ağır,**
**Cəng olsa meydana Rüstəmi-Zalam».**

«Üzündən Allahın salamı yağan» insan heç vaxt təfriqə törətməz, cəngə yol verməz. Amma həqiqət yolunda Rüstəm-

Zal kimi döyüşlərə hazır olar. Mükəmməl bilik, dərin kamal sahibi olan Miskin Abdal şah və şair Xətai önündə, ümmanlar qarşısında dəfələrlə sınanmış və bu sınaqlardan uğurla çıxmışdır. Buna görə də o, cəsarətlə deyir:

**«Ləbimdən süzülər hər şirin kəlmə,**
**Ağılım, kamalım bəlli aləmə.**
**Yığışsın şərimə alim, ülamə,**
**Cavabı çox olan çətin sualam».**

Şah İsmayıl Xətainin fəlsəfi görüşləri ilə bağlı araşdırmalar aparan fəlsəfə elmləri namizədi N.Hüseynovun əldə etdiyi qaynaqlardan bəlli olur ki, Qızılbaş şahı Miskin Abdalı çox sevdiyi yeddi şairdən biri hesab edərmiş. O, Miskin Abdalı hətta bir müddət sarayda şairlər birliyinə rəhbər təyin etmişdir. Xətai ilə Miskin Abdalın şeir deyişmələri də az olmamışdır. Onlar hətta bir-birlərinin şeirlərini də əzbərdən bilərmiş.

Böyük səltənətlərdən uzaq bir mahalda dųnyaya göz açan, amma dünyanın və zamanın gəldi-gedərini dərindən dərk edən bu zəka sahibinin Səfəvi sarayında şeir məclisinin başında dayanıb, sayılıb-seçilməsi, şahın xüsusi ehtiramını qazanması onun qeyri-adi qüdrət və istedadından xəbər verirdi:

**«Çox da asan deyil bu dağı aşmaq,**
**Geydim ayağıma dəmirdən başmaq,**
**Məramım bir olub Haqqa qovuşmaq,**
**Min hikmət sahibi Miskin Abdalam».**

Haqqa qovuşmaq üçün təriqət və mərifət mərtəbələrini keçmək lazım idi. Bu yollar Miskin Abdala asan başa gəlmədi, zamanın dolaşıq düyünlərindən mərdliklə keçdi, amma zəmanəyə giley-güzəranı da gizlətmədi:

**«Gecə yuxum yoxdur, gündüz qərarım,**
**Rüzgarım qoyubdur adada məni,**
**Tərəqqi dağından uçubdu tarım,**
**Fələk niyə saldı bu dada məni?!**

**Doğru söz deməyə çox utanıram,**
**Çünki zəmanəni bir az qanıram.**
**Elə alovlanıb, elə yanıram,**
**Söndürə bilməzlər suda da məni.**

**Mən Miskin Abdalam, dustaği-dərdəm,**
**Görmədim baharı ömrümdə bir dəm,**
**Ədalət yolunda elə bir mərdəm,**
**Qorxmaram əjdaha uda da məni».**

Məslək, əqidə sahibinin zamanın oyunlarını yaxşı dərk eləməsi, amma həqiqəti açıb deməməsi, abır-həya gözləməsi səbəbsiz deyildi. Çünki, bu sufi mürşidi həyatında bir çox ağır sarsıntılar keçirmişdi. Ömür yoldaşı vaxtsız dünyasını dəyişmiş, iki övladı Dağıstan dağlarında borana düşüb ölmüş, böyük məhəbbət və ehtiram bəslədiyi, himayəsinə sığındığı mürşidinin Çaldıran məğlubiyyətindən sonra guşənişə çəkilməsi və gənc çağlarında dünyasını dəyişməsi onu içəridən üzmüşdü:

**«İqlimin şahıydı Həzrət Süleyman,**
**Ədalətə pənah idi Nuşirəvan,**
**Şıx oğlu İsmayıl, o cənnət məkan,**
**Düşməz ələ, bir yadigardı getdi».**

Miskin Abdal hansı səfərlərdə, hansı vilayətlərdə olur-olsun, vətən həsrəti, el-oba yanğısı ilə yaşamış, bir an belə doğma yurdu unutmamışdır. Göyçə, onun dağları, yaylaqları, bu dağlarda at çapan igidləri Miskin şeirinin əzəli-əbədi qəhrəmanları kimi dönə-dönə xatırlanmışdır:

**«Qadir Allah, əlim əldən uzaqdır.**
**Yazıq könlüm, görən, indi dinərmi?**
**Vaxt yetişib, ömürdə qış-sazaqdır,**
**Şahin könlüm yuvasına enərmi?**

**Elim qalıb neçə dağlar dalında,**
**Qismətim var yazılıbsa alında.**
**Gedəcəyəm, ayaq qalsa yalın da,**
**Pir igidin çırağı da sönərmi?**

**Miskin Abdal, hanı zərdən libasın?**
**İnsan olan unudarmı obasın?**
**Yada salıb ulu-ulu babasın,**
**Axır günü Göyçəsinə dönərmi?».**

Miskin Abdal doğma yurda, onun füsünkar təbiətinə bütün varlığı ilə bağlı olan bir sənətkardır. Onun bu mövzuda qələmə aldığı şeirlər öz poetik əzəməti, bədii-estetik qüdrəti ilə özün-

dən sonrakı sənətkarlara əsl bir yaradıcılıq örnəyi olmuş və onların təsiri ilə neçə-neçə gözəl sənət əsərləri yaranmışdır. XIX yüzillikdə aşıq poeziyasını əlçatmaz bir zirvəyə qaldıran Dədə Ələsgərin ’’Dağlar” rədifli qoşmasının yaranmasında Miskin Abdalın eyni rədifli qoşmasının təsiri açıq-aşkar duyulmaqdadır.

Onun ’’Dolanar” rədifli şeirində də dağların bütün füsunkar gözəllikləri, zəngin təbiəti, çiçək dərən qızları, gədiklərdə dolaşan maralları, yağılar, basılmayan eli, qızıl qiymətli torpağı tərənnüm olunur:

**«Şişpilləkən dağların Şah dağıdır,**
**Maralları neçə başı dolanar.**
**Quldur-qaçaq bu yerlərə yağıdır,**
**Fürsət güdər dağı-daşı dolanar.**

**Ətəyində durna gözlü gölü var,**
**Zirvəsində dərilməmiş gülü var,**
**Yağılara basılmayan eli var.**
**Yazda yazı, qışda qışı dolanar.**

**Torpaqları zər yükünə yüklənib,**
**Könül sazı ”Şahsevən”ə köklənib,**
**Karvanları uzaq səmtə diklənib,**
**Nagah-nagah burda naşı dolanar.**

**Basılmazdır hər igidi, ərəni,**
**Biri saxlar neçə bəndi-bərəni,**
**Baxıb görsə dağda çiçək dərəni,**
**Ürəyində can ataşı dolanar.**

**Doğmaları bu torpağa yad olmaz,**
**Qəriblərin dəhanında dad olmaz.**
**Qürbət eldə Miskin Abdal şad olmaz,**
**Gözlərində kədər yaşı dolanar».**

Bu zəngin mündəricə şeirdə şair Göyçənin bütöv mənzərəsini təsvir və tərənnüm etmiş, qürbət ellərdə özünün doğma yurda həsrət qaldığını gizlətməmişdir:

**«Vətən deyib ağlayanın,**
**Göz yaşları selə dönər.**
**Axıb gedər gecə-gündüz**
**Bir məkanda gölə dönər.**

**Yolu yorğun dağ aşanın,**
**Axırı yox şöhrət-şanın.**
**Qürbət eldə yaşayanın,**
**Hər həftəsi ilə dönər.**

**Bir yandadır hay-haraylar,**
**Bir yandadır sonsuz vaylar,**
**Çil-çıraqlı çox saraylar**
**Bir gün yanıb külə dönər.**

**Mayasıdır haqdan halal,**
**Hər kəlməsi sirli sual.**
**Qürbət eldən Miskin Abdal**
**Bir gün olar, elə dönər».**

Zaman keçir, vaxt ötüşür, nəhayət, Miskin Abdal doğma yurduna dönür. Müqəddəs ocağa piranəlik edir. Məktəb açıb,

zəngin biliyini yeniyetmələrə öyrədir. Onun bu illərdə yazdığı şeirlərinin böyük qismində dünyadan və qocalıqdan şikayət motivləri üstünlük təşkil edir. Miskin Abdalı daxildən sarsıdan Çaldıran savaşında eyni etnik tarixi mənşəyə söykənən iki millətin bir-birinin qanını tökməsi idi; ’’Türklə əcəmin bir-birinə yağı kəsilməsi”, günahsız qanların axıdılması bu saf qəlbli təriqət şairini içəridən yaralayır. Aydın duyulur ki, Miskin Abdal Çaldıran savaşında iştirak etmiş, mürşidi yolunda can qoymuş, tökülən qanlara qarşı haray çəkmiş, paşalara yalvarmağa məcbur olmuşdur:

**«Canım qoydum mürşüdümün yolunda,**
**Sərgərdan qalmışam Urum elində,**
**Məxluq bada gedir cəllad əlində,**
**Paşam, mürvət eylə, belə kar olmaz».**

Göründüyü kimi, bu misralarda tarixi bir vaqiə və onun törətdiyi misilsiz vəhşiliklər özünün dolğun poetik ifadəsini tapmışdır.

Tariximizin səhifələrini vərəqlədikcə aydın olur ki, saray mühitindən heç bir şair və ya başqa sənət adamı razı qalmamış, hətta böhtanlara düçar olan Xaqanilər, Nəsimilər və Vaqiflər həbsxana künclərində nə qədər böyük məşəqqətlərlə üz-üzə qalmışlar.

Miskin Abdalın öz şeirlərində tez-tez xəbis və xain insanlardan giley-güzar etməsi çox güman ki, bu motivlərlə bağlı olmuşdur. Şairin ’’Məni” rədifli divanisi, bu baxımdan bir sıra mətləblərə aydınlıq gətirməkdədir:

**«Çərxi-gərdiş yarıtmadı dövlətdən, vardan məni,**
**Min bir dərdi-əzab verib, ayırdı yardan məni,**
**Sək rəqibin fitnə-feli çəkdi məni çarmıxa.**
**Yazıq Həzrət İsa kimi asdı divardan məni.**

**Türk əcəmə, əcəm türkə zülm eləsə günahdı,**
**Hər ikisi bir kökdəndi, yaradan da Allahdı,**
**Öz elinə düşmən kəsin axır günü kütahdı,**
**Qadir mövlam, uzaq eylə bayquşdan, sardan məni.**

**Qırxlar piri özü verib dərsimi ümman mənim,**
**Çətin girə ürəyimə ləini-şeytan mənim.**
**Seyyid Miskin Abdal mənəm, söz mənim, meydan mənim,**
**Qoruyanım, özün qoru xain dostlardan məni».**

Qüdrətli təriqət şairi ömrünün ahıl çağlarından çox gileylənir. Bir tərəfdən ömrünün dolanbac yollarını xatırlayıb, keçdiyi sufi ömrünün məqamları və mərtəbələri ilə iftixar duyur, qoruduğu təmiz, pak adı ilə fəxr edir, Allahın nurunun öz üzündə təcəlləsindən böyük məmnunluq duyur. O biri tərəfdən, gəlimli-gedimli dünyanın sonu ucuz ''ölümlü” anlarını duyub, düşündükcə içəridən qovrulub, bədbinliyə qapılır, axirət anlarını yada salır, dünyanın, dövlətin, varın puç olduğu qənaətinə gəlir. Şairin bu qəbil şeirlərində vida notları aydın duyulmaqdadır. ''Gedər”, ”Pir idi”, ''Nökərdim”, ''Məni”, ''Dönərmi”, ''Qocalıq”, ''Ağlaram”, ”Ya Əli”, ”A yaz ayları” ''Nədi?”, ''Qocalıram”, ''Olmusan” adlı şeirlərində dərin küskünlük və kədər motivləri özünü daha qabarıq hiss etdirir. Bütün bunlara baxmayaraq, sufi şair öz əqidəsində axıra qədər sabitqədəm və dönməzdir.

Xatırladığımız şeirlər XV yüzillik və XVI yüzilliyin əvvəllərində aşıq şeirinin çox zəngin məzmun və fəlsəfi mündəricəyə malik olduğunu təsdiqləyir.

Miskin Abdalın gəraylı, qoşma, divani və təcnisləri XV-XVI yüzilliкlər türkdilli şeirimizin nadir nümunələrindən sayıla bilər. Bu şeirlərdə zamanla səsləşən güclü təfəkkür mündəricəsi ilə yanaşı, bədii-estetik duyum, sözün daxili məntiqi, emosional təsir gücü və siqləti vardır. Rəngarəng şəriət və təriqət notları şeirin məntiqi məzmununu cilaladığı kimi, o dövr dilimizin zəngin çalarları da şeirin rəvanlığına xüsusi təravət gətirmişdir. XV yüzilliyin sonu və XVI yüzilliyin əvvəllərində xalq şeirində təcnisin çox nadir nümunəsinə rast gəldiyimiz halda, Miskin Abdal onun çox kamil nümunələrini yaratmışdır. ”El ata” təcnisinin dil zənginliyinə diqqət yetirək:

**«Yaz olanda büsatıdır dağların,**
**Ətəyində yer eləyər elata.**
**Qarı düşmən qovğa salsa üstünə,**
**Bata bilməz süvar olsa el ata.**

**Bir Allahdır ərşi-gürşü yaradan.**
**Adı çoxdur, bir adı da Yaradan.**
**Nə yaratsan yaradanı yarat, an**
**Qorx ki, sənə qara daşı el ata.**

**Miskin Abdal, şeytan anma, nər div an,**
**Müxənnətə tutacaqdır nər divan.**
**Haqqa doğru sən qoyubsan nərdivan,**
**Ona görə deyir sənə el: «Ata»».**

qatar-qatar düzüldü. Bunu padşah da hiss elədi. Cəlladlara dedi:

– Qoy ürəyini boşaltsın.

Hüseyn oxudu:

Axdı-axdı eynim yaşı, sel oldu,
Yarı gördüm, əlin verib yad ələ.
Qanlı sular zənaxdanda göl oldu,
Yarı gördüm, əlin verib yad ələ.

Qoç igidlər öz yurdunda gürz oldu,
Bu dərdsiz igidin dərdi yüz oldu,
Mərd igidə onda ölüm fərz oldu,
Desələr ki, yarın keçdi yad ələ.

Aləm bilir, sən Hüseynin gözüsən,
El içində dürlü-dürlü sözüsən.
Niyə qoydun sinəm üstə közü sən,
Demədinmi: ya yandıra, ya dələ?

Padşahla vəzir baxıb gördülər ki, Hüseyn Mahtəbanı zindana salanda ona yad əlin dəydiyinə heyfslənir. Söz tamama yetən kimi cəlladlar Hüseyni də, oğlan paltarında olan bacısı Züleyxanı da deyilən yerə apardılar. Ora çatanda cəlladlardan biri dedi:

–Padşah xəlvətcə tapşırdı ki, bu uşaqlar heyifdır, öldürmə, bir çöl heyvanı vurub onların alt köynəklərini həmin heyvanın qanına bulayıb, bizə gətir. Yoxsa vəzir inanmaz.

Bunu deyib, uşaqları soyundurub, alt köynəklərini çıxartmaq istəyirdilər ki, uşaqların birinin paltarının altından bir gümüş xəncər, o birinin qolundan bir qızıl qolbaq çıxdı. Hər ikisinin üstündə də Məhəmməd padşahın nişangahları var idi. Cəlladlar bu işə lap məəttəl qaldılar. Bunu görəndə qoca cəllad dedi:

– Yadınızdadırmı, padşah bir dəfə belə bir fərman verdi ki, mənim bu nişan xəncərimi, bu nişan qolbağımı kimin üstündən tapsanız, tutub yanıma gətirin. Mən onları xeyli vaxtdır ki, itirmişəm. Daha doğrusu, xəzinədən oğurlayıblar. Kim bu adamları tutub gətirsə, onu qiymətli ənam gözləyir. İndi həmin oğruları biz tapmışıq. Aparıb, verək padşaha, deyək ki, itən əşyalarını oğurlayan oğruları tapmışıq.

Hüseyn də, Züleyxa da sevindiklərindən bilmirdilər neyləsinlər. Bildilər ki, Məhəmməd padşah onların axtardığı atalarıdır. Uşaqların sevindiklərini görən cəlladlar bu işə lap məəttəl qaldılar. Dedilər:

– Deyin görək, siz niyə şadlanırsınız? Axı, siz padşahın oğrularısınız. O, birinci dəfə sizi bağışladı, bu dəfə bağışlamayacaq. Sizi camaatın gözü qarşısında dar ağacından asdıracaq. Heç, bir dəfə də uf deməyəcək.

Hüseyn dedi:

– Cəllad, sən saydığını say, gör fələk nə sayır. Sən bizi padşaha çatdır, sonrasından işin yoxdur. Onda bilərsiniz ki, biz kimik və niyə sevinirik.

Uşaqlar dinmədilər. Cəlladlar uşaqların ikisini də şahın hüzuruna gətirdilər və başlarına gələnləri, gördüklərini padşaha danışdılar. Uşaqların üstündən tapdıqları xəncər və bazubəndi onun qabağına qoydular. Elə bil, padşah yatmışdı, ayıldı. Ayağa qalxıb, ağlaya-ağlaya uşaqlarını bağrına basdı, onlara

yer göstərdi. Hamı buna lap heyran olmuşdu. Vəzir yerindəcə quruyub qalmışdı. Biləndə ki, bu, qardaşının uşaqlarıdır, irəli yeriyib, hər ikisini qucaqlayıb, üz-gözlərindən öpdü, bağrına basdı. Sonra padşah da, uşaqlar da başlarına gələnləri danışdılar. Hamı bildi ki, bu ekiz uşaqların biri oğlan, biri qızdır. Məhəmməd padşah əmr elədi, Züleyxanı o biri otağa aparıb, oğlan paltarını soyundurub, şahanə qız paltarı geyindirdilər. Züleyxa oldu əsl Züleyxa. Bu gözəlliyi görənlərin ağlı başından çıxdı.

Geniş əhvalpürsanlıqdan sonra padşah dedi:

– Ay bala, nə yaxşı oldu sizi öldürmədik. Görəsən, sənə kömək duran kim oldu?

Bunu eşidən Hüseyn sazını sinəsinə qaldırıb, onun pənahında duranları, görək, atasına necə tanıtdırdı. Biz deyək, siz də şad olun:

Göydən yerə əmr olundu,
Endi Quran, demirəmmi?
Biri İncil, biri Tövrat,
Biri Zəbur demirəmmi?

Padşah dedi:

– Ay bala, de görüm, sənə daha kimlər kömək durdu?

Aldı Hüseyn sözünün o biri bəndində, görək, atasına nə dedi, o da nə eşitdi:

Məhəmməd Bürağa mindi,
Gözəl məzhəb, yaxşı dindi,
Göydə gəzən Aynan Gündü,
Şahi-mərdan demirəmmi?

Padşah yenə dedi:
– Ay bala, heç bu cəlladlardan sənə rəhmi gələn oldumu?
Hüseyn aldı görək, sözünün o biri xanəsində nə dedi:

İsrafil surunu çala,
Bu dünya kimlərə qala.
Az qalırdı canım ala,
Qoca cəllad demirəmmi?

Padşah yenə dedi:
–Bala, çox qorxdunmu, bəs, sənə daha kim kömək oldu?

Hüseynəm yoxdu günahım,
Ərşə qalxdı ünüm, ahım,
Dada yetdi Nəcəf şahım,
Cənab Əli, demirəmmi?

Söz tamama yetən kimi Məhəmməd şah əmr elədi ki, Lut şəhərindən uşaqlarının anası Gülxarı, nənəsi Nabatı, babası İsmayılı də gətirdilər. Sən demə, vəzir Mehdixanın oğlu Yusif də Züleyxanı görüb, ona vurulmuşdu. Qardaşlar razılaşdılar. Toy tədarükünə başladılar. Məhəmməd padşah uşaqların anası Gülxarla öz toyunu da qatdı bu toylara. Qərəz Məhəmmədlə Gulxarın, Hüseynlə Mahtəbanın, Yusiflə Züleyxanın toyları başladı, nə başladı.

Eşit çobandan. O çobandan ki, padşah qardaşı ilə bir gecə onun qonağı olmuşdu, Məhəmməd padşah da çobana zor-xoş yazılı bir kağız parçası vermişdi. Çoban da onu qoymuşdu ala-

çığın harmasına. Aradan on beş-on altı il keçmişdi. Bir gün bir oxumuş adam çobanın qonağı oldu. Ordan-burdan söhbətdən sonra birdən çobanın yadına düşdü ki, o vaxtı qonağın verdiyi kağız harmadadır. Öz-özünə dedi: bir, gətirim görüm, bu adam o kağızı oxusun, görək, orada nə yazılıb. Çox deyirdi, al, bu kağızı saxla, bir gün gərəyin olar. Qərəz, çoban kağızı gətirib, qonağa verdi. Qonaq oxuyub, gördü ki, bunu yazan Xorasan vilayətinin padşahı Məhəmməd şahdır. Yanındakı vəziri də qardaşı Mehdixan imiş. Çoban eşitdiklərinə inanmadı. Qonaq çobana dedi ki, bu günlərdə Məhəmməd padşahın oğlunun toyudur. Bunu eşidən çoban padşahın kağızını cibinə dürtüşdürüb, dedi:

– Qonaq qardaş, mən getdim, sən də başına bir çarə qıl.

Qonaq qalxıb, öz yolu ilə getməyə başladı. Çoban da sürüsünü qabağına qatıb, «Xorasan hardadır» deyib, hayladı. Bir neçə gündən sonra gəlib, şəhərə çatdı. Sürünü düz şahın sarayının yanına apardı. Bunu tez padşaha xəbər verdilər. Padşah əmr elədi ki, çobanı hüzuruma gətirin.

Qərəz, çoban padşahın hüzuruna gəldi. Salam verəndən sonra padşah dedi:

– Çoban, nə istəyirsən?

Çoban dinməz-söyləməz cibindəki kağızı çıxardıb, padşahın qağabına qoydu. Padşah o saat çobanı tanıdı. Ona «xoş gəldin» elədi, yanında yer göstərdi.

Çoban dedi:

– Qibləyi-aləm sağ olsun, eşitdim oğlunun toyunu eləyirsən. Ona görə, mənim bu toya nəmərim otardığım sürümdür. Götür, halal-halal xoşun olsun.

Çobanın bu alicənablığı padşahın lap xoşuna gəldi. Adam göndərib, çobanın köç-külfətini də gətirdilər. Heyvanlarını özünə bağışladı. Üstəlik, ona o qədər ənam verdi ki, çobanın yeddi arxa dönəninə də bəs eləyərdi. Sonra da çobana yaxşı bir imarət tikdirib, ona yaxşı bir iş tapşırdı.

Qırx gün, qırx gecə Xorasanda bir toy oldu ki, gəl görəsən. Toyun qırxıncı günü molla çağırıb, Məhəmmədin kəbinini Gülxara, Hüseyninkini Mahtəbana, Yusifinkini də Züleyxaya kəsdilər.

Aşıq da bu dastanı duvaqqapmayla tamamladı. Toya mübarəkdarlıq verdi. Biz də böyük ustadımız Aşıq Ələsgərin bir müxəmməsi ilə dastanımızı başa çatdıraq:

Bir gözəl gördüm bu gün,
Canlarda candan artıqdı,
Qaməti sərv ağacı,
Zülfü reyhandan artıqdı;
Qabağı ayna kimi,
Qaşı kamandan artıqdı;
Dodaqları qaymaq kimi,
Dəhanı şandan artıqdı,
Gözləri dan ulduzu,
Şöləsi şamdan artıqdı.

Qoşulub üç gözələ,
Bağları seyran eləyir,
Birisi sağında gedir,
Söhbəti hər yan eləyir;

Birisi solunda durub,
Canını qurban eləyir;
Arxasında biri yenə,
Köksünə fərman eləyir,
Üç qızın ortasında,
Gör, necə divan eləyir;
Özü rəiyyət balası.
Hökmü sultandan artıqdı.

Şah kimi bir divan qurub,
Gözəllərə cərmə kəsər;
Yanaqları əlvan-əlvan,
Mah üzündə tellər əsər;
Durna kimi sığallanıb,
Sağ əlində güllər əsər;
Gahdan silər üz-gözünü,
Gah döşünün üstə qısar;
Ağlımı başımdan alıb,
Ciyərimə dağlar basar;
Buxağında fil-fil cürə,
Xalı mərcandan artıqdı.

Çevrilib dörd yanına,
Deyərsən ki, tərlan baxır;
Çalmasını əyri çalıb,
Telləri altından çıxır;
Zülfünə şana çəkib,
Gözlərinə sürmə yaxır;
Danışar o, şirin-şirin,

Deyərsən ki, bülbül oxur;
Qoynu cənnət bağıdı,
Müşk qoxur, ənbər qoxur;
Boyu xoş bənövşədən,
Ətri süsəndən artıqdı.

Gəl üzünə ayna tutub,
Qələm qaşı əymələdi;
Açmış idi köksü bağın,
Məni görüb, düymələdi;
Sinəsi ağ billur kimi,
Ətrafı rövşən elədi;
Gül sinəsi havalanıb,
Köynəyi yırtmaq dilədi;
İstədim ki, yaxın gedim,
Yoldaşları hərbələdi;
Dedilər: yaraşmazsan,
Bu xanım səndən artıqdı.

Yeridikcə ikram elər,
Zərli corab gül başmağa;
Hər tərəfə yaxa pulu,
Adət edib oynaşmağa;
Dodaqları məzələnib,
Daldalanıb zər yaşmağa;
Mələklər həya eylər,
Üzbəsurət danışmağa.
Görmədim bərabərin,
Deyəm ki, bundan artıqdı.

Kəklik kimi səkə-səkə,
Yüz işvə-nazla yeriyir;
Ləblərindən peyda olub,
Qəndindən şəkər əriyir;
Gözləri pusqu qurub,
Qoluna qolbaq sarıyır;
Sevdasına könül verən
Vaxtsız, vədəsiz qarıyır;
Müxtəsər, Aşıq Ələsgər,
Ağzında dilin quruyur;
Deyirsən ki, bu bixəbər,
Fəqfur xaqandan artıqdı.

# MEHRİBAN AYI NAĞILI

Deyirlər ki, Göyçə mahalındakı Sarıyaqub (Zərgərli) kəndinin sol tərəfindəki təpəliklər, dağlar sıx, qalın meşəlik imiş. Gül-çiçəyin cənnət ətri, quşların şən nəğmələri, heyvanların müxtəlif-müxtəlif səsləri, nəriltiləri adamı heyran edər, vəcdə gətirərmiş.

Meşədə bir ana ayı və iki dənə də balası yaşayırmış. Ayı və onun bir cüt potası nə meşədəki heyvanlara, nə də insanlara hücum etməzlərmiş.

Ana ayı potaları ilə birlikdə həftədə bir dəfə Miskin Abdalın ocağına ziyarətə gələrmiş. Onların üçü də qapıdan su içib, Miskin Abdalın evinin ətrafını dolanıb, sonra oynaşa-oynaşa geri qayıdıb, meşədəki mağaralarına gedərlərmiş. Kənd camaatı, Göyçə əhli bu işə lap məəttəl qalarmışlar. Heç kəs bu mehriban ayıya və onun balalarına dəyməzmiş. Hamı bu mehriban, gözəl ayıları Miskin Abdalın ayıları kimi tanıyırmış.

Bəzi cavanlar bu potaları vurmaq istəsələr də, həmin fikirdən uzaqlaşırlar. Çünki onlar həm Miskin Abdalın müqəddəsliyindən qorxurdular, həm də böyük ustad Qızılbaşlar şahının vəziri idi.

Ancaq iki nankor qardaşın gözlərini qan örtür. Onlar necə olursa-olsun bu potaları ovlamaq qərarına gəlirlər.

Bir gün ana və bala ayılar yenə də Miskin Abdalın ocağını ziyarət edib, axşamüstü geri qayıdarmışlar. Tanrının bu sirrinə paxıllıq edən nankor qardaşlar ayı və potaların qayıtdıqları yolda pusqu qururlar. Qardaşlardan birini qəflətən yuxu tutur, yatır. Şaban ayıq qalır. Bu ara ayı və balaları onlara yaxınlaşır-

lar. Ayıq olan Şaban tez yayı çəkib, oxu atır, ox potanın birini qanına qaltan edir. Ana ayının çəkdiyi nərə dağı-daşı lərzəyə gətirir, ancaq ovçuya hücum etmir.

Şaban vurduğu potanın dərisini soyub, ətini bir kənara doğrayıb, yığır. Sonra o, potanın dərisinə bükülüb, həmin yerdə oturur. Bunu görən ayı yenidən bir nərə çəkir. Yatan qardaş ayının səsinə ayılır. O, cəld oxunu yaxınlıqdakı ayıya tuşlayır. Gedib görür ki, vurduğu ayı yox, ayı dərisinə bürünmüş Şaban qardaşıdır.

Qardaş başlayır nalə çəkib, fəryad qoparmağa. Bu mənzərəni görən ayı gözlərinin yaşını sel kimi axıda-axıda ağzını göylərə uzadıb nərildəyir. Yəni demək istəyir ki, ’’Allah bilən yaxşıdır”.

Qardaş özünə qarğışlar edir. Bu gözlənilməz hadisədən bərk sarsılır. Qardaşının meyidini dalına alıb, üç gün dağı-daşı hərlənir. Nəhayət, gəlib qardaşının və ayı potasının vurulduğu yerə çatır. Qrada da can verir.

Camaat qardaşları kənd qəbristanlığında dəfn olunmağa qoymaq istəmirlər. Ancaq Miskin Abdal kənd adamlarını razı salır. Bildirir ki, bunların hamısı Ulu Yaradanın sirridir. Qardaşlar Miskin Abdalın məsləhəti ilə kənd qəbristanlığında dəfn olunurlar.

Bu möcüzədən sonra axşam qardaşların qəbirlərindən iki işıq: yaşıl və qırmızı işıq yanır. Bu işıqlar yana-yana əvvəlcə Miskin Abdalın qapısına gəlir, sonra potaların su içdikləri yerdə yanıb-sönür. Daha sonra potanın və qardaşların öldükləri yerə gəlib, burada yanıb-sönür, nəhayət, qeyb olurlar. Bu hadisədən sonra adamlar Miskin Abdal ocağının möcüzəsindən heyrətə gəlir, ona daha güclü səcdə edirlər.

O vaxtdan ana ayı və potası küsüb, bu yerdən gedir və bir daha görünməz olurlar. Onların ancaq yuvası yadigar qalır.

Bu hadisə pir, kəramət sahibi olan böyük ustadı da bərk sarsıdır. Bu kədər Miskin Abdalın könlünü riqqətə gətirir. O, sazını sinəsinin üstünə qaldırıb, yanıqlı bir hava ilə bu hadisəni kiçik bir dastana çevirir. Bu münasibətlə dediyi söz belədir:

Namərd ovçu, sənin qolun qurusun,
Niyə vurdun sakit gələn potanı?
Anasını balasından ayırdın,
Nəhlət tutar insafını satanı.

Ana ayı hönkür-hönkür ağladı,
Nərə çəkib, ürəkləri dağladı,
Dönüb-dönüb balasını qoxladı,
Dağıtmadı günahlara batanı.

Sən potanı qıyma-qıyma doğradın,
Soyub, dərisini bir yana atdın,
Dəriyə bürünüb, qəflətən yatdın,
Qarğış tutar namərd işlər tutanı.

Qardaşı o yanda söykənib daşa,
Qurduğu pusquda getmişdi huşa,
Bunu görən ayı gələrək coşa,
Nərildəyib ayıltdı tez, yatanı.

O, ayılıb pota bildi Şabanı,
Yayı çəkib, oxla vurdu nişanı.
Axıb getdi qardaşının al qanı,
Allah vurar aralığı qatanı.

Allah haqqı iblislərdən qorusun,
Qardaş dedi: ’’Kaş ki, qolum qurusun,
Səni nişan alan gözüm kor olsun!”
Hər kəs gərək pis işindən utana.

O, başlayıb ayı kimi uladı,
Meyid dalda harayasa yol aldı,
Üç gün-gecə dağı-daşı doladı,
El qınadı cəzasına çatanı.

Nəhayət, dayandı çiynində Şaban,
Pota ölən yerdə o da verdi can.
Heç vaxt yerdə qalmaz axan nahaq qan,
Tanrı vurdu namərd oxu atanı.

Ayı küsdü, ayaq kəsdi qapıdan,
Bir də su içmədi həyətdə qabdan.
Ürəyi od tutub, yandı əzabdan,
Görünmədi meşələrin sultanı.

O gündən, hər həftə, cümə axşamı,
Yandı Yaradanın iki rəng şamı.
Belə möcüzəyə mat qaldı hamı,
Nəhlət ilə yad etdilər şeytanı.

Miskin Abdal hönkür-hönkür ağladı,
Saz götürüb, sinələri dağladı.
Mehriban ayıya dastan bağladı.
Belə gördü bu zulumu, xatanı.

***"Palitra" qəzeti, 24 iyul 2001-ci il***

# BELƏ YAZIRLAR...

***Əzizə Cəfərzadə***
***(”Bakı-1501” tarixi romanından)***
***səh. 239, 247,260***

...Bu gün şeir məclisində, demək olar ki, yeni ad çəkiləcəkdi. Doğrudur, Xətai əvvəllər də onun şeirini eşitmiş, vərəqlərdə oxumuşdu. Lakin bu gün məclis bütünlüklə bu şəxsə – Miskin Abdala həsr olunacaqdı...

* * *

...Şah üzünü sağ əlində oturmuş Məliküşşüarəyə tutdu:

– Ustad, nədən başlayırıq?

Şeir məclisini rəsmi eşikağası deyil, Məliküşşüarə idarə edirdi.

– Hökmdarım, bu gün əsas məqsədimizdən əlavə, maraqlı bir qonağımız var. Buradan xeyli uzaq olan Çuxur Səddən (Göyçədə dağ-yer adıdır) gəlib. Vətənimizin şimalı, elə bil ki, sənətkarlar arasında bölgü aparıb: mənim doğulduğum Şirvan torpağı şair yetirib. Bakı torpağı gözəl rəssam-zərgərlər, qərbdə Çuxur Səddə – Göyçə mahalı aşıqlar yetirir, – heç birisinə də çatan olmaz.

Elə, bu zaman bayaqdan heç kəsin nəzərini cəlb etməyən, şahın böyrünə sığınmış təlxək özünə məxsus cürət və lağlağılıqla Məliküşşüəranın sözünü kəsdi:

– Bəli, hər şəhərin öz siması olmalıdır. Necə ki, ərəblər deyib: sənətkarlıq – Bəsrədə, nitq gözəlliyi Kufədə, ləzzət-

li eyş-işrətli həyat – Bağdadda, xəyanət – Reydə, paxıllıq – Heratda, əxlaqsızlıq – Nişapurda, xəsislik – Mərvədə, qürur – Səmərqənddə, igidlik – Bəlxdə, ticarət – Misirdə olan kimi.

Hamı qəhqəhə çəkdi.

– Bəs, sənin doğulduğun Təbriz? – sualı şah vermişdi.

– Yaxşı dübbələr yetirir, əzizim!

Gülüş ara verəndə şah üzünü yenə də Məliküşşüəraya tutdu:

– Eşidirik səni, ustad!

– İzninizlə, sizə bu gün həmin mahir el sənətkarlarından birini – Miskin Abdalı təqdim edirik, əşrafi-əla.

– Buyursun...

Çalğıçılar arasında əlində üçtelli saz olan uca boylu, arığaz, surətindən işıq yağan bir adam qalxdı. Əynində bəhilqol çuxa, sərməboğazlı köynək, ev hanasında toxunmuş mixəyi şalvar var idi. Qara nazik qaşları gicgahlarınacan uzanırdı. Aralı gözləri qonur idi, bu gözlərin içində qızılı-sarı şüa saçan bir cüt nöqtə insanı əsrarlı heyrətə salırdı. O, sağ əlini sol döşünə basıb, hər üç tərəfə baş əydi.

İsmayıl şah gözü ilə Miskin Abdalın qəddü qamətinə, sarı Günəş ziyasından bir cüt qığılcım alıb, nur saçan gözlərinə baxdı. Qeyri-ixtiyari, yanında əyləşmiş Məliküşşüəraya asta səslə dedi:

– Göyçənin Miskini, Abdalı budusa, məğruru, ehtişamlısı nə təhərdi?

Məliküşşəranın dodaqları xəfifcə qımıldandı. Ömründə ilk dəfə şah məclisinə çıxan aşıq qonağı şəkkə-şübhəyə salıb, utandırmamaq üçün cəld pıçıltıyla cavab verdi:

– Yəqin ki, hökmdarıma bənzəri olar.

– Heç, bu da geri qalmaz.

Amma hər iki müsahibin simasında sanki görünməz niqab var idi, danışdıqları duyulmurdu.

Miskin Abdal bir daha bilavasitə hökmdara tərəf hörmət salamını yerinə yetirib, ədəb məqamında dayandı. Dodaqlarından bircə kəlmə eşidildi:

– İzin.

Məclisdə yaşca ən qoca adam olan qazı: ’’İzindir”, – dedi. Aşıq üçtelli sazı bağrına basıb, taziyənəni tellərə vurdu və xırda-xırda səkə-səkə məclisin ortasına gəldi:

Dostu-mehribanım, yetiş imdada,
Səndən qeyri yox imdadım, ağlaram.
Ah çəkib, dağlara salaram səda,
Qohum gəlməz, gülər yadım, ağlaram.

Dəstində zülfüqar, düldülə süvar,
Məhzərül-əcayib, bir adı kərrar.
Müşkülə düşmüşəm, könlüm intizar,
Sən gəlməsən, ey ustadım, ağlaram.

Salma nəzərindən, salma, Ilahim,
Dar gündə köməyim, pöştü-pənahim,
Ərşə bülənd olub fəryadu-ahım,
Abdaldı, Miskindi adım, ağlaram.

Məclisdən ’’afərin, mərhaba” səsləri göyə ucaldı. Aşığın səsi də, nəfəsi də, ifasındakı məlahət də, doğma dildə oxuduğu qoşmanın şeriyyəti də, hökmdarın cəddinə işarə edən misra-

lar da, sazı çalmaq məharəti də, oynaması da, əski dədə-ozan ənənəsindən gələn ədəbi də salonda əyləşənlərə xoş gəlmişdi. Ürəklərindən idi, onlar doğma dildə aşıq şeir və musiqisini birinci dəfə eşitmirdilər. Sənətə qiymət verməyi bacaran adamlar idi. Odur ki, aşıq Miskin Abdalı böyük bir məhəbbətlə, dönə-dönə Qurbanini dinlədikləri məhəbbətlə dinləyirdilər. Miskin Abdal isə sənətin gözəlliyinə, mənasına vurğun əsl aşıq kimi şeriyyətə dalmışdı. Havadan-havaya keçdikcə şeir də dəyişir, qoşmadan təcnisə, təcnisdən gəraylıya, gəraylıdan divaniyə keçirdi. Nəhayət, o, ədəb dairəsini gözlədi, hər növdən bir-iki bənd oxuyub, susdu. Yenə də məclisə böyük hörmətlə sağ əlini sol döşünün üstünə qoyub, hər üç səmtə baş əydi. Keçib, yerində durdu.

Şeriyyətə dalmış Xətai şair-hökmdar əl işarəsilə bitikçibaşını yanına çağırdı. Nə dedisə, dərhal bitikçibaşı qalxıb, qonşu otağa keçdi, tez də qayıtdı. Arxasınca əlində kətil tutmuş xəttatla qayıtdı. Şah ucadan dedi:

- Yaz! Himayəmizi və Sarıyaqub (Miskin Abdalın Göyçədə anadan olduğu kənd) kəndinin baratını ona veririk – Miskin Abdala – nəsilbənəsil.

Bitikçibaşı, elə buradaca, fərmanın qaralamasını yazdıqca, xəttat cəld onu Səmərqənd kağızına göçürdü. Kətilin üstündə xırda qablar, kiçik piyalələrdə mavi, qırmızı, qara, sürməyi rənglər, ayrıca xırda piyaləciklərdə qızıl və gümüş ərintisi qoyulmuşdu. Xəttat adəti hərəkətlə qamış qələmi gah piyalələrin, gah fərmanın üstündə gəzdirirdi. Heç bir urub keçməmiş fərman hazır oldu, bitikçibaşı dalı-dalı sürüşüb, onu hökmdarın qənşərinə tutdu. İsmayıl qamış qələmin bir cizgisiylə fərmana qol qoydu. Bitikçibaşı yerinə, xəttat isə otağına qayıtdı. Məli-

küşşüəranın işarəsilə Miskin Abdal hökmdarın qarşısına gəldi. İki addım qalmış diz çökdü, yeri öpmək üçün əyiləndə (görünür saray ədəbini ona irəlicədən təlim etmişdilər) şair-padşah dilləndi:

– Yox, yox, ustad, sən yeri öpmə! Yerin çox ucadır. Buyur! Al! Bizə bu gecə verdiyin böyük zövqün müqabilində bu fərman kiçik və acizdir. Sən bizə bir daha sübut etdin ki, doğma anamızın dili yüksək şeriyyətə malik, musiqili dildir. Bu dildə ən gözəl hissləri, ən idraki, dərin fikirləri musiqi dilinə çevirib, tərənnüm etmək olar. Sənə və bunu sənə ilham edən böyük xəlqə əhsən və eşq olsun!

Miskin Abdal şairin sözlərini böyük bir fərəh, həyəcan içində dinləyirdi. Fərmanı aldı, öpdü, gözləri qarışıq alnına qoydu və qalxdı:

– Ömrün uzun olsun, qurbanın olum! – dedi. – Bu fikir, bu əqidə ki, səndə var, doğma el-obamız, ulusumuz-oymağımız ömrünə duaçı olacaq həmişə!

O, qalxdı, dal-dalı yeriyərək, mövqeyinə qayıtdı...

* * *

Vəziri-əzəm əllərini sinəsinə qoyub baş əydi, söz üçün izn istədi:

– Qibleyi-aləm, bəlkə, keçmişdəkilər kimi mürasələni fars dilində yazaq?! Axı, o yerlərdə kafirlər içində bizim dili oxuyub başa düşən olmaz.

Onun qulağında hələ də qolu bağlı Xudafərin körpüsündən keçib gələn Qurbaninin, Çuxur-Səddən aşmış Miskin Abdalın ana dilindəki səsi, əşarı səslənirdi.

***<u>Fərman Kərimzadə,</u>***
***<u>("Xudafərin körpüsü" tarixi romanından, Bakı - 1982)</u>***
***cəh. 344-346***

Çox da böyük olmayan dəstələri (İsmayılın) artıq Göyçə gölünün kənarındaydı. Qarabağı adlamış, Tərtər çayının vadisi ilə isti sular qaynayan Dəlidağa gəlmiş, ''Sarı yer" yaylağından Göyçə gölünün sahilinə çıxmışdılar. Buradan isə Cığın vadisi ilə Çuxur Səədə enəcək, Arazı keçib Ərzincana gedəcəkdilər.

* * *

İsmayıl:

– Gözəl yerlərdir. Bu hansı dəryadı?

– Bu Göyçə gölüdür. Suyunu bulaqlardan alır. Bu sular isə bal kimi şirindir. Onun Tirrix (ərəbcə – qızıl) balığı kimi dünyada dadlı balıq yoxdur. Ondan xeyli tutdurmuşam. Amma burada bir möcüzə də var.

– Nədir o möcüzə?

Lələ İsmayılı isti gölün kənarına gətirib, daşın qayaya yapışmağını danışdı, göstərdi.

– Doğrudan da möcüzədir!

– Bu möcüzəni isə zamanın sahibinə Allah Taala özü əta eləyib.

* * *

– Ya mürşüdüm, möcüzə göstərdiyin yerə ad qoymalıyıq.

– Ad. Tut niyyət, at daşı.

– At, daşı!

Onların qayaya daş atdıqları yerin adı, ”At daşı” qaldı.

***(Göyçədə, Qaranlıq (Martuni) rayonunda yer adidir)***

***Oqtay Əfəndiyev,***
***’’Azərbaycan Səfəvilər dövləti’’ kitabı, Bakı, 1993,***
***səh. 295***

’’V.F.Minoriski ’’Təzkirat əl-mülük” əsərində (səh. 125) ’’Anonim tarix”ə əsaslanaraq qeyd edir ki, İsmayıl Gilanda düşmənlərindən gizlənəndə ona xidmət edən təriqət qərargahı onun Lələsindən əlavə, Xəlifət əl-Xülafədan, Abdaldan, Dədə və Xədimdən ibarət olmuşdur”.

***Oqtay Əfəndiyev,***
***’’Azərbaycan Səfəvilər dövləti’’ kitabı, Bakı, 1993,***
***səh. 11***

Şah İsmayıl Xətainin nəsil şəcərəsi, həyat və fəaliyyətinə dair XVI əsrdə fars dilində yazılmış və ədəbiyyatda şərti olaraq ”Şah İsmayıl Səfəvinin tarixi” (’’Anonim tarix”) adı ilə tanınan, əlyazmalar şəklində London və Kembric kitabxanalıraında saxlanılan, həmin dövrə aid ən qiymətli əsər kimi istinad edilən kitab vardır. “Nəzərdən keçirilən əsərin müəllifinin şəxsiyyəti barədə müxtəlif fikirlər söylənilmişdir” (X.Beveric, V.Minoriski, V.Hints və b.). Qulam Sərvərin fikrincə, həmin əlyazmanı müəllifin özü nəzərdən keçirmiş və öz əli ilə orada düzəlişlər edilmişdir.

Çünki, bu və bir sıra digər haşiyə yazılarında yazan adamın özünü bildirən ’’Miskin Qul” (Bəndəyi Kəmtərin) ifadəsi işlədilir. (Ghulam Sarwar. ”Shah İsmail Safawi” Aligarh. 1939.”)

Qeyd: (Miskin Abdalın şeirlərində, digər bir sıra təxəllüsləri ilə yanaşı, ’’Miskin Qul” və ya ’’Miskin Qulam” təxəllüslərindən istifadə etməsi həmin əsərin müəllifinin Miskin Abdal olması barədə ciddi ilkin ehtimal irəli sürməyə imkan verir və maraqlı fakt kimi tədqiqatçıların diqqətinin həmin məsələyə yönəldilməsini zəruri edir.

(Müəllifin reydi: Miskin Abdalın ”Ya Əli” qoşmasında:

**«Seçmə muxsullardan Miskin Qulamı,**
**Kərəm et kövsərdən badə ya Əli!»;**

yaxud, ”Əlif-Lam” qoşmasında təxəllüslərinin çoxluğuna işarə edən:

**«Mimnən Məhəmmədəm, Cimnən Cəfərəm,**
**Ləqəbi çox olan Miskin Abdalam»**

beytləri həmin ehtimalı bir daha möhkəmləndirir. –T.H.)

***Hüseyn İsmayılov***
***(’’Aşıq yaradıcılığı: mənşəyi və inkişaf mərhələləri’’ kitabından, Bakı - 2002), səh 207***

«Haqq şahı, haqq aşığı – ’’haqq ilə sirdaş olan” Şah İsmayıl Azərbaycanın şimalına yürüşlərə hazırlaşarkən qoşun sərkərdələri ona Göyçə mahalından keçməyi məsləhət görürdülər. Çünki, Səfəvilərin yaxın dostları, inanılmış müridləri artıq bu ərazidə qızılbaş sufi təriqətinin yerli əhali tərəfindən qəbul edilməsi üçün möhkəm zəmin yaratmışdılar. Həm də bir vaxt Ağdamar qalasında gizlədilən yeniyetmə İsmayıl (’’Divani Şah İsmayıl – Aləmarayı 125-ci vərəq) Göyçə meşələrində keyiklər, ayı ovuna çıxıb, yalçın qayaların, uca zirvələrin yalında köhlən oynatmışdı. ”Ayı ovu” miniatürü, məhz Göyçədə 13 yaşlı İsmayılın ov mərasiminə həsr olunub».

***Abbas Mazanov***
***1989-cu ildə ”Ədəbiyyat və incəsənət’ qəzetinin 32-ci nömrəsində çap olunmuş ’’Sarıyaqubdan başlanan yol’’ yazısından***

«Abdalın ’’Miskin” təxəllüsünə istinad edərək, onun Gədəbəyin “Miskinli oba”sından olmasını söyləmək o qədər də inandırıcı ola bilməz. Ona görə ki, ’’Miskin” ləqəbli aşıqlar çox olub: Miskin Əsəd, Miskin Əli, erməni aşığı Miskin Bürcü, hətta Miskin ləqəbli gürcü aşığı və başqaları».

***Məmməd Aslan***
***”Ədəbiyyat və incəsənət” qəzeti,***
***“Miskinlərin ən məğruru” məqaləsi***
***30 noyabr 1974-cü il***

## “Miskinlərin ən məğruru”

«...Əsmətel nənə Miskin Abdalın yadicəsidir. Yaşı yetmişi haqlayıb. Üzü nurlu nənədir. Aşıqlar demiş, bizim ipək qarılara çəkib.

Miskin Abdaldan qalan yadigarlara baxmaq istəyimi duyub, dedi:

– Miskin Abdalın yadigarlarını qız nəslindən olan kimsə qoruyur, dünyadan gethagetdə nəsildən ağlı kəsən bir qız uşağına tapşırır, o da baba evinə gəlib, ömür boyu ziyarətlik şeylərin qayğısına qalır.

– Abdal babamın ocağına maral sürüsü gələrmiş. Arvadı bunları sağıb, qatıq çalarmış. Güzəranları bundan aşarmış. Bir axşam şər qovuşur, marallar sağına gəlmir. Handan-hana sürü qapıya axışır. Arvad südü sağıb, ocağın üstünə qoyur. Böyürdən qalxan alov qazanın içinə işıqlandıranda arvad vahnövsə ilə ərini çağırır:

– Evin yıxılmasın, ay Abdal, marallardan qan sağılıb. Südü qan kəsdi.

Abdal babam deyib ki, yəqin Şadman hardasa nahaq qan tökdü. Gecənin bir aləmində Şadman gəlib çıxır. Öyünür ki:

– Ata, arxayın yat, qəlbinə bir adam dəymişdirsə, əvəzində on adamın qanını axıtmışam.

Babam qəzəblənir, çəliyi əlində, beləcə, burum-burum burulur. Arvad oğlunun tərəfini saxlayır. Abdal babam hirsindən ocaqdan bir armud kösövünü onun arxasınca atır. Kösöv yerə sancılır. Höyüş olduğundan kök atıb bitir.

...Deyirlər, Göyçə mahalında ilk məktəbi də Miskin Abdal açıb.

...Miskin Abdal ayrı ’’miskin” olub. ’’Miskin” təxəllüslü şairlərin ən məğruru sayılıb. Miskin Abdal XVI əsr şifahi poeziyamızın maraqlı nümayəndələrindəndir. Dörd yüz ilə yaxın müddətdə misraların dillərdə dolaşsın, öz zərifliyini, təravətini saxlasın; şairin ən böyük hünəri də budur, xoşbəxtliyi də. Aşıq Talıb xatırlayır ki, aşıq Ələsgər tez-tez Sarıyaquba gedib, Abdal ocağını ziyarət edər, orada ürəklə çalıb-çağırarmış.

Şifahi poeziyamızın kamil ustadlarından Növrəs İman Miskin Abdalın adını xüsusi hörmət və ehtiramla çəkir:

**«Yaxşı bəyənmişəm Miskin Abdalı,**
**Cəm imiş başında ağlı, kamalı...»**

Bu günlərdə Kirovabaddan (Gənъədən) folklorşünas Sədnik Paşayevdən məktub almışam. Miskin Abdaldan əlinə düşən qoşma və rəvayətləri göndərib. Hazırda əlimin altında şairin 20 qatardan artıq şeiri var.

***<u>Gülruba Kərimova:</u>***
***<u>23 aprel 1999-cu il, ”Xalq qəzeti”ndə çap olunmuş</u>***
***<u>”Göyçə haqqında düşüncələr” məqaləsindən</u>***

’’Qorqud boylarında dəfələrlə adı səslənən, vəsfi sığallanan, Uzun Həsənin yaylaq yeri olan qədim Göyçədə Şah İsmayılın iqamətgahı vardı. Onun səlahiyyətli səfiri və vəziri olmuş Miskin Abdala öz əli ilə bağışladığı möhür, əsa və sairələr bu günlərə qədər qorunub, saxlanılır.

***<u>Yaqub Babayev</u>***
***<u>filologiya elmləri namizədi,</u>***
***<u>’’Kommunist’ qəzetinin 18 aprel 1991-ci il tarixli</u>***
***<u>nömrəsində çap olunmuş ’’Miskin Abdalın söz</u>***
***<u>gülüstanından” yazısından</u>***

’’Miskin Abdalın bir müddət Gədəbəy rayonu ərazisində yaşadığını söyləmək olar”.

# BELƏ DEYİBLƏR...

* * *

”Ey mömin insanlar, Miskin Abdal mötəbər şəxsdir, ona sidq ürəklə inanın, nə mətləbiniz varsa ondan diləyin”.

***Şah İsmayıl Xətai (1515-ci ildə)***

* * *

’’Miskin Abdal böyük şəxsiyyətdir, dühadır. O, təkcə qədim Göyçə mahalının yox, həm də Azərbaycan adlı bir dünyanın fəxridir. Lakin zəmanə onu müvəqqəti olaraq unutdurub. Ancaq vaxt gələcək, Miskin Abdal öz adı, öz böyüklüyü ilə tanınacaq. İnanın, o gün gələcək”.

***Mirzə İbrahimov (1973-cü iidə)***

* * *

’’Miskin Abdal qüdrətli sənətkardır. Onu kiminləsə müqayisə etmək olmaz. Ustad sənətkarın:

**«Şahım, nə yatıbsan, dünya xarabdır,**
**Haqq özü yatmayıb, ayaq üstədir!»**

– misraları əlçatmaz bir ucalıq olduğundan xəbər vermir-mi!?”

***Yaşar Qarayev (1999-cu iidə)***

* * *

**«Musa sözlərini söyləyər aşkar,**
**Deyiləm dünyadan naşı, bixəbər.**
**Miskindən başlamış, Abbasa qədər,**
**Cəmi aşıqların kanı məndədir».**

***Aşıq Musa (XVIII-XIX əsr)***

* * *

**«Yaxşı tanıyıram Miskin Abdalı,**
**Cəm imiş başında huşu, kamalı».**

***Növrəs İman (XX əsr)***

* * *

**«Gəl sənə söyləyim Miskin Abdalı,**
**El içində yüksək idi iqbalı**
**Miskin idi bu şairin ləqəbi,**
**Göyçədə açmışdı molla məktəbi.**
**Oğlu Şadman neçə nahaq qan etdi**
**Gəlmədi sağma, marallar getdi».**

***Nərimanlı şair Bəhman***
***(XX əsrin ikinci yarısı)***

# BELƏ DEYİRLƏR...

«Dühanı və möhtəşəmliyi şərh və tədqiq etdikcə, söz və izah kiçilir. Biz Tanrı Miskini qarşısında miskinləşirik. İlahi! Bir insanda neçə Ali keyfiyyət cəmləşirmiş?! Aşiqlik, Poeziya, Musiqi, Övliyalıq! Belə bir əvəzolunmaz, bənzərsiz şəxsiyyət imiş Miskin Abdal!

***professor Hüseyn İsmayılov***

* * *

«Dövlətçilik baxımından Xətai, dini baxımdan Miskin Abdal "Şah-Mürşid" idilər».

***professor Mürsəl Həkimov***

* * *

«Miskin Abdal elə bir əlçatmaz ucalıqdır ki, oradan baxmaq mümkün olsaydı, Haqqın dərgahı görünərdi».

***Tofiq Hüseynzadə***

* * *

«Miskin Abdal elə bir yeganə tarixi şəxsiyyətdir ki, dünyanı gördüyü və düşündüyü qədər dərk edirmiş. Təriqətdə və cəmiyyətdə bundan böyük və əzəmətli ucalıq mümkün deyil».

***Mehdi Tofiq oğlu Hüseynzadə***

* * *

«Xoşbəxtəm ki, Miskin Abdal kimi bir dahi şəxsiyyətin ilk əzəmətli portretini yaratmaq mənə nəsib olub. Bu portreti ya-

ratmazdan əvvəl çox düşünüb, daşındım. Nəhayət, 15 gündən sonra yuxumda Miskin Abdalı gördüm və ayılıb, gördüyüm kimi eskizini verdim və portreti yaratmağa başladım. ’’Miskin Abdal” mənim şah əsərimdir».

***Cabbar Quliyev***
***(əməkdar rəssam)***

# BELƏ SÖYLƏYİRLƏR VƏ RƏVAYƏT EDİRLƏR
## (Qəzetlərdən)

***Zeynalabdin Cəfərov:***

Bir dəfə Şəmkirdə toyların birində bəylərdən biri ayağa qalxıb, ucadan deyir:

– Ayə, aşıq, o padşahın ’’Dünya, səndə nəyim qaldı” sözünü oxu.

– Bəy, başına dolanım hansı padşahın?

Bəy deyir:

– Əə, bilmirsən? Aşıqların padşahı Göyçəli Miskin Abdalın.

* * *

“Misri”, Oxşarı”, “Yedəkləmə” saz havaları da Miskin Abdalındır. “Yedəkləmə” bir gözəlləmədən o birinə keçərkən, arada çalınan, oxunan saz havasıdır.

* * *

Miskin Abdal Şah Xətaini Şərqin-Qərbin sərkərdəsi hesab edərmiş. Miskin Abdalın sözləri zərbməsəl kimi işlənərmiş.

# KƏŞKÜL BULAĞI

Deyirlər, Şah Xətainin Göyçədə iqamətgahı varmış. O, tez-tez bu yerlərə, cənnət hesab etdiyi bu yurda dincəlməyə, gəzməyə gələrmiş. Bir dəfə Şah İsmayılla Miskin Abdal səhər-səhər gəzə-gəzə gedib, "Vers dağı" deyilən yerdə bir bulağın başına çatırlar. Miskin Abdal bulağı Qızılbaşlar şahına "Abu-Kövsər" kimi qələmə verir. Xətai sudan içib, ustadın sözünü təsdiqləyir. Miskin Abdal sudan içmək istərkən, kəşkülü bulağa düşür. Şah əlini salıb, kəşkülü bulaqdan çıxarır. Ancaq buz bulağın suyu çox soyuq oduğundan şahın əlləri titrəməyə başlayır. Bunu görən Miskin Abdal deyir:

– Ya mürşüdüm, sənin qüdrətli əllərin heç bir döyüşdə titrəmədi. Lakin adi bir bulağın suyu onu titrətdi.

Şah cavabında deyir:

– Ustad, özün demişkən, axı, bu su adi su deyil. Bunda abu-kövsər tamı, dadı, gücü var. İlahi Göyçədə hər şeyi möcüzələr üstündə qurub. Bu möcüzələrin qarşısında mənim qollarım da, özüm də acizdir. Hələ, bu dağların əzəmətini görürsənmi? Bu gündən də bu bal kimi şirin dadan buz bulağın adını "Kəşkül bulağı" qoyuram.

Bunu eşidən Miskin Abdalın könlü tüğyan edir, qəlbi vəcdə gəlir, Göyçə dağlarının gözəlliyinə, əzəmətinə yenidən baxıb, heyran qalır. Ürəyi coşur. Telli sazını sinəsinə basıb allı-güllü, şehli, şux mənzərəli dağları "Şah dağlar" qoşması ilə ürəkdən tərənnüm edir.

***"Palitra", № 78, 24 iyyl 2001-ci il***

# MİSKİN ABDAL ÖMRÜNDƏN YARPAQLAR

Zeynalabdin Cəfərov: ''Göyçənin Kərkibaş kəndindən olan, 1980-ci illərin əvvəllərində 100 yaşında dünyasını dəyişən dayım İsmayılov Kərəm Oruc oğlu aşıq olmasa da, sinədəftər idi, bütün məclislərdə aşıqlar onunla razılaşmalı olurdu. Sinəsində iyirmidən çox dastan, çoxsaylı rəvayətlər, söhbətlər, saysız-hesabsız şeirlər vardı. Demək olardı ki, onun aşıq sənətində bilmədiyi şey yox idi. Ən çox sevdiyi sənətkar isə Miskin Abdal idi. Onu əzbərdən bilirdi. Danışdıqca danışırdı, doymurdu, yorulmurdu. Miskin Abdalın sözlərini başqasının adına oxuyan aşıqları dərhal susdurardı.

Dayımın söylədiyinə görə, o dövrdə Miskin Abdalın ''Dünya səndə nəyim qaldı" şeiri dillər əzbəri imiş. Elə toy, şadlıq, şadyanlıq olmazmış ki, aşıqlar bu şeirin sözlərinə yazılmış mahnını bir neçə dəfə oxumasınlar.

Dayım iyirminci əsrin əvvəllərində Şəmkirin Xınna kəndində Nağı və Tağı bəy qardaşlarının himayəsində yaşamalı olur. O vaxt burada olan toylara aşıq, bir qayda olaraq, Göyçədən dəvət olunarmış.

Bir dəfə Nağı və Tağı bəy qardaşları Kərəm dayıma deyirlər:

– Gedərsən Göyçə elinə. Toyumuza bir neçə aşıq gətirərsən. Elə aşıq gətir ki, onlar Miskin Abdalın "Dünya səndə nəyim qaldı" şeirini bilməmiş olmasın. Hamını heyran edən 11 bəndlik həmin şeiri böyük ustad ölüm ayağında deyib.

Dayım Kərəmin dediyinə görə, ustad məclisə başlayanda və qurtaranda belə deyərmiş:

– Rəhimli və mərhəmətli Allahın adı ilə. Hörmətli xanımlar və ağalar; qoca Allahdan arzum budur, budur, budur:

Dövran sürün başa, başa, başa.

Ömrü vurun yüz yaşa, yaşa, yaşa.

Aşıqlar bu şeiri ’’Misri”, ’’Zarıncı” və “Dilqəmi” havasında oxuyarlarmış.

Dayım söyləyərdi ki, Miskin Abdalın sözləri zərb-məsəl kimi işlənərmiş. Miskin Abdal Şah Xətaini Günəşə bənzədir, onu Şərqin-Qərbin sərkərdəsi hesab edirmiş.

Göyçədə Qızılbaşlar şahının iqamətgahı varmış. Bir dəfə Xətai ilə Miskin Abdal gəzə-gəzə Göyçədə Vers dağı deyilən yerdə bir bulağın başına çatırlar. Miskin Abdal bulağın suyunu şaha abu-kövsər kimi qələmə verir. Şah Xətai sudan içib, ustadın sözünü təsdiqləyir. Miskin Abdal da su içmək istərkən, kəşkülü bulağa düşür. Bunu görən şah bulağa ’’Kəşkül” adını verir. O vaxtdan bulağın adı ’’Kəşkül” qalır.

* * *

Dayım Kərəmin dediyinə görə, Miskin Abdala aləmi-röyada Təbrizli İlan Mahmudun Sənubər adlı qızı buta verilir. Çətin də olsa, butasına qovuşur. Toy günündən bir neçə ay sonra ölüm onları ayırır. Bu münasibətlə ”Yar deyə-deyə” şeirini qoşub, oxuyur.

Bu hadisədən sonra Miskin Abdal ikinci dəfə 50 yaşında evlənir. Onun Şadman, Məleykə, Əli və Həsən adında dörd öv-

ladı olur. Sonrakı iki övladı Dağıstan dağlarında boranda ölür. Miskin Abdal oğlu Şadman adam öldürdüyünə görə, müqəddəs ocağının qızına verilməsini vəsiyyət edir.

''Miskin'' və ''Abdal'' dini təxəllüslərdir. ''Abdal'' daha geniş və çox məna kəsb edir. Onlardan biri də qeyrət və bahadırlıq kimi işlədilir. Bu fikir Jozef Tiflisinin ''Vaqiati-Mir Veys və Şah Hüseyn'' əsərində də aydın göstərilmişdir: ''Onlar abdal uğanları (abdal əfqanlar) adlandırılan tayfadandırlar. Qeyrətlidirlər və zatlarında bahadırlıq vardır''.

Şah İsmayıl Xətai ilə Miskin Abdal arasında oğul-ata məhəbbəti varmış.

Miskin Abdal ömrünün yarpaqları zaman keçdikcə qalın-qalın kitablara, dastanlara çevriləcəkdir.

***"Azad Azərbaycan" № 35,***
***9 may 2001-ci il***

# MİSKİN ABDAL YADDAŞLARDA

Hüseyn İsmayılov: ”Saz hikmətdir, üsyandır, kəsərdə Misri qılıncdır, ürəkləri ram edir! Çünki, sazın səsində Allahın sevgisi var. Bu sevgini yaradan Miskin Abdal böyüklüyü, qüdrəti olmuşdur. O, özündən əvvəlki ozan-aşıq sənətində ucalan bu möhtəşəm məbədin qadir memarı, ustad nəqqaşıdır. Onun qibtə olunan qüdrəti sayəsində qopuz dizin üstündən üzü Allaha sarı, ürəyin üstünə qalxmış, ozançılıq kamilləşərək, əzəmətli aşıq sənətinə çevrilmişdir”.

Zeynalabdin Cəfərov: ”Bu rəvayəti əslən Göyçənin Göysu kəndində olan Gədəbəy rayonunun Slavyanka kəndində yaşayan mərhum Rüstəmov Rüstəmin dilindən qələmə almışam.

Deyirlər, payızın son aylarında Miskin Abdal Gədəbəyin yaylaqlarında olan ilxısını, mal-qarasını çobanlarla birlikdə geriyə – Göyçə elinə doğru aparırmış. Onlar Göyçə torpağındakı ’’Böyük yoxuş” deyilən yerdəki bulağın başında oturub dincəlir, nahar edirlər. Bu vaxt yırtıcı vəhşi heyvanlar sürünün ətrafında görünürlər. Ancaq mal-qaraya hücum etmirlər. Çobanlar deyirlər:

– Abdal əmi, bu vəhşilər nə yaxşı ata-ilxıya, mal-qaraya toxunmurlar?!

Miskin Abdal deyir:

– A bala, bunun sirrini Allah bilir. Durun bir ağsaq keçidən, qoyundan kəsib doğrayın, Allahın o heyvanlarına paylayın.

Onlar nahardan sonra yenə yola düzəlirlər. Elə, bir az getməmiş bir qar, bir çovğun başlayır ki, gəl görəsən. Boran mal-qaranı, ilxını geriyə qaytarır. Miskin Abdal da Haçadil atının başını geriyə döndərir, gəlib həmin bulağın başına çatırlar. Miskin Abdal görür ki, bir gözü yavanlıqla, bir gözü qızıl pulla dolu heybəsi yadından çıxıb, bulağın başında qalıb. Sədaqətli Kəbkəb adlı iti də heybəni yiyəsiz qoymayıb, onun yanında qalıb. Mal-qara, ilxı uzaqlaşdıqca, Kəbkəb hürməyə başlayıb. O, hər dəfə hürdükcə boran, tufan qopur və sahibini geri qaytarır. Bunu görən Miskin Abdal atdan enib üç rükət namaz qılır və sonra ”Sən yetiş dadıma” qoşmasını deyir.

Hava sakitləşir. Onlar sağ-salamat gəlib, vətənə çatırlar. Zərgərli (Sarıyaqub) əhli onların qabağına çıxır, birdən-birə başlayan qardan, çovğundan, borandan gileylənirlər. Miskin Abdal bunun səbəbini və başlarına gələnləri hamıya danışır, qıldığı 3 rükət namaza görə boran, çovğunun 3 gün olacağını Allahın hökmü kimi bildirir. Hamı bir daha Miskin Abdala səcdə edir”

Qənbər Həsənov: “Sarıyaqub kəndinin cənub tərəfində Buğabölünən adlanan bir tala var. Bu, Miskin Abdalla bağlıdır. Deyirlər, Miskin Abdal ocağına sağına gələn marallar örüşdən ilk dəfə bu talaya enər, buğa bölünüb, burada qalar, ana marallar sağına gedərmiş. Elə, o vaxtdan da bu yerin adı Buğabölünən qalıb”.

Əli Behbud oğlu Süleymanlı: “Deyirlər, ocaqda bişən maral südü bir gün qan kəsir. Arvadı bunu ərinə çatdırır. Bunu eşidən Miskin Abdalın halı dəyişir, kədərlə deyir:

– Yəqin oğlum Şadman adam öldürdü...

Bir azdan Şadman gəlib çıxır. Doğrudan da o, atasının ’’Sarı yer” yaylağındakı mal-qarasına, ilxısına basqın edən oğru-quldurlardan bir neçəsini öldürübmüş. Bunu eşidəndə Miskin Abdalın hirsindən əlindəki çəlik burum-burum olur. O, ocaqdan bir höyüş odun çəkib, qeyzlə oğluna atır. Ulu Tanrı Şadmanı atasının qəzəbindən qoruyur. Ağac Şadmana çatmamış yerə sancılıb, qol-budaq atır, yanıq bir armud ağacına çevrilir”.

Tuyğun Yunis qızı Süleymanova: “Atam-anamdan, nənəm-babamdan dəfələrlə eşitmişəm. Onlara da öz uluları danışıb ki, Miskin Abdalın Şadman, Məleykə, Əli və Həsən adında dörd övladı olub. Rəvayətə görə, sonrakı iki uşağı Dağıstan dağlarında boranda ölüblər. Oğlu Şadman adam öldürüb, qan tökdüyünə görə, ata müqəddəs ocağının ona qalmasını məsləhət bilmir. Vəsiyyət edir ki, varı-mülkü, bini-bərəkəti oğlu Şadmana qalsın, müqəddəs ’’ocaq” ata payı kimi qızına verilsin. Qızı həm də yaxın əmisi oğlunun gəlini imiş. Gəlin evi həm də ruzidən qıt imiş.

Şadman atasının vəsiyyətinə əməl edir. O vaxtdan Zərgərli (Sarıyaqub) kəndində Miskin Abdalın adı ilə bağlı iki tayfa: Şadmanlı – oğul və Ocaqlı – qız tayfaları yaranır”.

Fərid Fəxrəddin oğlu Dəmirov: “Babam Şövkətin atası Dəmir Dağıstanın Axtı rayonundan olub. Müəyyən səbəblər üzündən sonralar Qusar rayonunun Kiçan kəndində məskunlaşıb.

1974-cü ildə 70 yaşında dünyasını dəyişən babamın atası Dəmir kişi danışırdı ki, Dağıstanın Axtı rayonunda Miskinci (azərbaycanca Miskinli) kəndi var. Bu kənd Dağıstanda yeganə kənddir ki, şiədir. Kəndin adamlarının rəngi də yerli adamların rənginə oxşamır, qarabənizdirlər, görkəmlərində bir alicənablıq, məğrurluq var. Deyirlər, neçə-neçə yüz il bundan əvvəl Miskin Abdal Qızılbaşlar hökmdarının fərmanı ilə Dağıstana elçi göndərilir. Həmin azərbaycanlılar olan kəndin adamları bu xəbərdən çox sevinir və Miskin Abdalı kəndə qonaq dəvət edirlər. Miskin Abdal onların sözünü yerə salmır. Miskin Abdalın bu kəndə gəlişi əsl toya, el bayramına çevrilir, qurbanlar kəsilir, ömrünə dualar oxunur. Kənd əhli bir nəfər kimi onun təbliğ etdiyi şiəlik dini təriqətinə iman gətirir. Həmin gündən yaşadıqları kəndi Miskin Abdalın şərəfinə ’’Miskinli” adlandırırlar. Bir müddət keçəndən sonra kənd əhli elliklə Miskin Abdalın vətən sorağı ilə Göyçə deyib, köç edir. Onlar Dağıstan dağlarında amansız borana düçar olurlar. Bu boranda adamların yarısı ölür, sağ qalan yarısı geriyə – Miskinli kəndinə qayıdıb, yenidən yaşamağa məcbur olurlar. Bu fəlakəti onlar Miskin Abdalın ruhunun qəzəbinə tuş gəldikləri kimi qəbul edirlər. O gündən and içirlər ki, bir daha Miskinli kəndindən heç yana köçməyəcək, bu kəndi Miskin Abdalın ruhuna ehtiram kimi həmişə abad edəcəklər. Uzun vaxt keçdikdən sonra kənd adamları öz ana dillərini də unudurlar”.

Cahangir Məmmədov: ’’Miskin Abdal mənim ulu babamdır. Bu gün onun oğul şəcərəsi olan Şadmanlılar nəslini dörd

nəhəng tayfa birləşdirir: Məşədi Hasanlı, Yaqublu, Abdulla uşağı və Qədimlər. Bunların da öz qolları var.

Mən Yaqublu tayfasındanam. Kənd adamlarının dilində bu tayfa həmişə gah «Yaaflı», gah da «Yavıxlılar» kimi deyilib. Mən bunu təbii hesab edirəm. Babam Yaqub dövrünün görkəmli adamlarından biri olub. Ona Rusiya çarının ağalıq kağızı da verilib. (On doqquzuncu əsr). Babam Yaqubun rəngi ifrat sarı olduğundan kiçik yaşlarından ’’Sarı” ayamasını qazanıb. Sonralar bu ayama ləqəbə çevrilib. On doqquzuncu əsrdə ermənilərin Göyçə mahalında törətdikləri növbəti fitnəkarlıqdan sonra babam Sarı Yaqub burada həyatı yenidən bərpa edir. Daha doğrusu, o, ulu babası Miskin Abdalın yaşadığı kəndi abadlaşdırıb. Onun təşəbbüsü ilə köçənlərin hamısı geri qayıdıb. Babam dünyasını dəyişdikdən sonra el hörmət əlaməti olaraq bu kəndi daha Zərgərli kimi yox, ’’Sarı Yaqub” kimi tanıyıb. Onu da deyim ki, Zərgərli həm də Miskin Abdalın lap qədimdən mənsub olduğu tayfanın adıdır”.

Miskin Abdalın oğul şəcərəsindən biri olan Yaqublu tayfasından nəvəli, nəticəli son babalar bunlardır: Sultan, Sənhan, İbrahim, Yaqub, Cahangir, Həmzə, Cahad, Musa, Kərim, Rəhim, Nəcəf, Vəli, Əli, Mürsəl, Muxtar, Xıdır oğlu İsgəndərin oğlu Xıdır, Həsən, Qəzənfər, Hümmət və başqaları.

Aşıq Hacı Bayramov: “Miskin Abdal aşıq olmasa da, Azərbaycan aşıq, saz-söz dünyasının azman ustadıdır. Aşıq sənəti, bütövlükdə, ondan miras qalmışdır. Onun saz havaları çox olmuşdur. Lakin ustadın digər qiymətli yaradıcılıq nümunəsi

kimi, saz havaları da özündən sonrakı neçə-neçə yüzilliklərin içində çətin yollar keçmiş, çoxusu unudulmuş, çoxusunun adı dəyişdirilmiş, bizə bir qədər saz havası gəlib çatmışdır. Mətbuatda verilən məlumata görə, onun hazırda iyirmidən çox saz havası məlumdur. Bu saz havalarının çoxusu indi də çalınır. Çalınmayanlarının isə sorağında olmalı, arayıb- axtarmalıyıq. Mən inanmıram ki, Kərəmin, Koroğlunun adına o qədər saz havası olsun. Bir də, çoxadlı saz havaları da az deyildir. Bunları dəqiqləşdirmək lazımdır”.

”Bir rəvayətə görə, Miskin Abdal sazın şah pərdəsini Şah İsmayıl Xətainin şərəfinə ”Şah pərdə” adlandırmışdır”.

***”Paritem’ № 03,***
***9-10 yanvar 2000-ci il.***

# MİSKİN ABDAL DÜNYASINDAN YENİ SORAQLAR

Miskin Abdal dünyası sirli-soraqlıdır. Son illər onun hərtərəfli şəxsiyyəti, ədəbi, ictimai, siyasi fəaliyyəti, həyatı, taleyi istiqamətində Respublika Elmlər Akademiyası səviyyəsində tədqiqat işləri uğurla davam etməkdədir. Miskin Abdalsevərlər bu xeyirxah işdə öz bildiklərini əsirgəmir, lazımi yerlərə, ünvanlara mühüm məlumatları həvəslə çatdırır və bunu böyük savab iş bilirlər. Bu məlumatlar, bir qayda olaraq, dövri mətbuatda çap olunur, oxucular tərəfindən sonsuz rəğbət və məhəbbətlə qarşılanır.

İndiyədək çap olunmayan bir neçə sorağı oxucuların nəzərinə çatdırırıq.

Folklorçu Zeynalabdin Cəfərov: ”1970-ci illərin əvvəlləri idi. Yolum Azərbaycan Yazıçılar İttifaqına düşmüşdü. İttifaqın sədri, xalq yazıçısı Mirzə İbrahimovla görüşdüm. Məni çox mehribanlıqla qəbul etdi. Gəlişimin məqsədini bilib Ağ Aşıqdan, Aşıq Alıdan, Aşıq Ələsgərdən şeir oxumağımı xahiş etdi. Mən onun xahişinə məmnuniyyətlə əməl etdim. Çox razı qaldı. Sonra gözlərimin düz içinə baxıb dedi:

– Heç Miskin Abdaldan bir şey bilirsən?

Mən əlimdəki dəftərdən Miskin Abdalın ’’Deyişmə” janrındakı şeirindən başladım:

**Gözlərin qandadır, qanda,**
**Kirpiyin sandadır, sanda,**

**Hərə bir yandadır, yanda,**
**Ağlama, yarım, ağlama.**

**Əzizim tatar məni,**
**Qul kimi satar məni,**
**Yarım vəfalı olsa,**
**Axtarar, tapar məni.**

Mən şeiri oxuyub tamamlamışdım ki, o, dəftəri əlimdən çəkib, aldı və özünəməxsus tərzdə dedi:

– Belə gözəl şeiri elə sönük oxumazlar. Belə gözəl şeiri bax, belə oxuyarlar! – deyib, ”Deyişmə”ni yenidən başdan-ayağa xüsusi intonasiya ilə oxudu və əlavə etdi:

– Ədəbiyyatda bu Miskin Abdal üslubudur. Özü də bilirsən, ”Deyişmə”ni kimə deyib?

Dedim:

– Xeyr.

O dedi:

– Miskin Abdal bu ”Deyişmə”sini bir odunçu oğlanla onun sevdiyi qızın ayrılıq hicranına deyib.

Miskin Abdalın zəngin, bənzərsiz və təkrarolunmaz ədəbiyyat dünyası özündən sonrakı şairlərin, xüsusilə, aşıqların yaradıcılığına çox güclü təsir göstərib. Miskin Abdalın dini mövzudakı şeirləri Qasım Bəy Zakirin yaradıcılığında öz əksini tapıb.

Göyçənin tarixi çox qədimdir. Miskin Abdalın anadan olduğu Zərgərli (Sarıyaqub) burada ən qədim kəndlərdən biridir. O vaxt bu kənddə cəmisi 25-30 ailə yaşayarmış. Burada gözəl bir el adəti də var imiş. Qızların bir hörüyü onların subay olduğunu, iki qoşa hörük ərə getdiyini, hörük kökdən iki, sonra bir olanda həmin qadının dul olduğunu bildirərmiş. Hörüklərin uc-

larındakı açıq tətiklərin (xırda ponçaqların) sayı qadının neçə qızı, düyünlü tətikləri isə neçə oğlu olduğuna işarə imiş.

Adətləri də tarixi qədər qədim və zəngin olan Göyçənin haqqında nə qədər desən, danışmaq olar. Bu torpaq, axı, Miskin Abdal kimi tarixi şəxsiyyətlərin vətənidir.

Miskin Abdal böyük şəxsiyyətdir, dühadır. O, təkcə qədim Göyçə mahalının yox, həm də Azərbaycan adlı bir dünyanın fəxridir. Lakin zəmanə müvəqqəti olaraq onu unutdurub. Ancaq vaxt gələcək Miskin Abdal öz böyüklüyü ilə tanınacaq. İnanın, o gün gələcək!”

Əli Behbud oğlu Süleymanlı, ziyalı: “Sarıyaqub kəndi öz əzəli adını Miskin Abdalın mənsub olduğu ’’Zərgərli” tayfasından götürüb. Son əsrlər Göyçə ermənilər tərəfindən dəfələrlə dağıdılıb, viran olub və elliklə köçürülüb. Miskin Abdalın oğul nəslindən olan Yaqub adlı adlı-sanlı şəxs 19-cu əsrdə Zərgərli kəndində həyatı yenidən bərpa edir. Göyçə mahalında onun şəxsi nüfuzu olduğuna görə bir çoxları kimi Yaqub kişiyə də Rusiya çarının ağalıq kağızı verilir (həmin sənəd qədim İrəvan arxivindədir). Yaqub Ağanın ayaması da varmış: ’’Sarı”. Kənd adamları bu ləqəbi ona rənginin sarı olduğuna görə veriblərmiş. Uşaqlığından el arasında Sarı Yaqub kimi tanınan Yaqub Ağa dünyasını dəyişdikdən sonra hamı hörmət əlaməti olaraq, bu kəndi onun adı ilə tanıyır: “Sarıyaqub”.

Süleymanova Tuyğun Yunis qızı, ağbirçək: “Ata-anamdan Miskin Abdal haqqında eşitdiklərimi bu gün də olduğu kimi xatırlayıram. Onlar deyirdilər ki, nə qədər ki, Miskin Abdal sağ imiş, hər ilin yazında və payızında Göyçə mahalının üstündən

qatarla uçan durnalardan hər biri onun müqəddəs ziyarətgahına bir ağ lələk salarmış. Valideynlərim həm də deyirdilər ki, kənddəki Miskin Abdalın oğul şəcərəsi olan ”Şadmanlı”lar bizim dayılarımızdır.

Gülruba Kərimova, sənətşünas: ’’Sona nənə həmişə Miskin Abdalın çəliyinə and içərdi. Söyləyərdi ki, Miskin Abdalın ocağına qeybdən marallar sağına gələrmiş. Bir gün ocaqda bişən südün qan kəsdiyini görən Miskin Abdal bərk hirsələnib:

– Yəqin oğlum Şadman adam öldürdü! – deyib, əlindəki çəliyini qeyzlə yerə elə bərk vurur ki, bu vaxt zəlzələ baş verir”.

Aşıq Hacı Bayramov: ”Lap cavan vaxtlarımdan qonşu Sarıyaqub kəndində tez-tez xeyir işlərə gedərdim. Kənd ağsaqqallarından bir rəvayəti daha tez-tez eşidirdim. Onlar söyləyirdilər ki, Miskin Abdal ölüm ayağında oğlu Şadmanı çağırıb deyir:

– Oğul, günahın olsa da, olmasa da adam öldürüb, qan tökübsən. Buna görə müqəddəs ocağımın sənə qalmasını məsləhət bilmirəm. Məndən sonra ”Ocağ”ımı ata payı kimi qızıma ver.

Şadman atasının vəsiyyətinə əməl edir. Ancaq ər evində olan bacısı sabah durub, görür ki, ’’Ocaq” yerində yoxdur, öz əvvəlki yerinə qayıdıb. Bu hal bir neçə dəfə təkrar olur. Axırda qız ağlayıb, deyir:

– Ay qardaş, axı, mən nə günah iş görmüşəm ki, atamın ”Ocağ”ı bizdə durmur? Qardaşı ona ürək-dirək verib, ”Ocağ”ı yenə də bacısına qaytarır. Şadman həmin gecə yatıb, yuxusunda görür ki, atası Miskin Abdal deyir: ’’Oğul, evdəki çəliyimi ”Ocağ”a qoy. Geri qayıtmayacaq”. Belə də olur. O vaxtdan

kənddə Miskin Abdalın adı ilə iki tayfa: “Şadmanlı” – oğul və ’’Ocaqlı” – qız tayfaları yaranır.

Camal Cumar oğlu Ramazanov (milliyyətcə ləzgi): ’’Dağıstanın Axtı rayonunda Miskincə (Azərbaycanca Miskinli) kəndi var. Miskin Abdalın adı ilə bağlı olan bu kənd Dağıstanda yeganə kənddir ki, şiədir. Bu kəndin adamlarının rəngi də yerli əhalinin rənginə oxşamır. Deyirlər, bu kəndin adamları nə vaxtsa bütövlükdə harayasa köç ediblər. Onlar Dağıstan dağlarında borana düşüblər. Adamların yarısı boranda ölüb. Sağ qalan yarısı isə geriyə, öz kəndlərinə qayıdıb, yenidən yaşamağa başlayıblar. Xeyli vaxtdan sonra onlar öz ana dillərini də unudublar”.

Hacı Zəki İslam: ’’Göyçə Miskin Abdalın əzəli və əbədi vətənidir. Mən bu dediklərimi Məşhəd, Kərbala, Məkkə, Mədinə, Nəcəf, Samirə, Kazımiyyə, Qum, Təbriz, Hələb, Dəməşq (Şam) və digər müsəlman şəhərlərində və ölkələrində olarkən təsdiq etmişəm. Bu yerlərin heç birində Miskin Abdalın ’’müştərisi” yoxdur. Çox təəssüf ki, bəzi nankorlar şəxsi iyrənc məqsədləri naminə hələ də Göyçə mahalına qonşu bölgələrdə Miskin Abdala yeni-yeni ”müştəri”lər axtarmaq sorağındadılar. Deyəsən, belə getsə, Miskin Abdalın tezliklə Lerik rayonunda da təzə ’’qohumları” tapılacaq. Miskin Abdalın şəxsiyyətinə xəyanətin bir adı var: şərəfsizlik!”

***’’Kaspi” № 119,***
***14-15 dekabr 2000-ci il***

# MİSKİN ABDALDAN YENİ TAPINTILAR

Qədim Göyçə mahalının Kərkibaş kəndindən olan 80 yaşlı filoloq Zeynalabdin Cəfərov həm də folklorçu müəllim kimi tanınır. Onun Göyçə aşıq mühiti ilə bağlı axtarışları diqqəti daha çox cəlb edir. Zeynalabdin Cəfərov böyük dövlət və din xadimi, sufi şair, filosof, sərkərdə, diplomat, Azərbaycan aşıq, saz-söz dünyasının ilkin ustadı, müqəddəs ocaq sahibi, gözəl müəllim, maarifpərvər insan, hörmətli el ağsaqqalı, övliya Miskin Abdal (əsl adı Hüseyndir) haqqında da xeyli dəyərli məlumatlar toplamışdır. Ümumiyyətlə, o, topladığı əksər folklor nümunələrinə görə 1980-ci illərin əvvəllərində 100 yaşında dünyasını dəyişən dayısı Kərəm Oruc oğlu İsmayılova həmişə minnətdardır.

Zeynalabdin müəllim bu günlərdə öz şəxsi arxivini araşdırarkən böyük ustadın 1950-1960-ci illərdə dayısı Kərəmin dilindən yazıya aldığı bir neçə rəvayətini və şeirlərini tapmışdır. İndi onları oxuculara təqdim edirik:

* * *

Qədim yaşayış məskəni olan Göyçənin Basarkeçər rayonundan Qaranlıq (Martuni) rayonuna gedən yolun sol tərəfində dağlar qoynunda olan Çamırlı kəndinə yaxın, bir az da aşağıda, dağların ətəyində bir kənd var imiş. Arxa tərəfi qayalıqlardan ibarət olan bu kəndin ilk adı Qaraqaya olub. Kənd sakinləri bu adı ona görə veriblər ki, qədimlərdə burada çoxlu

yırtıcı vəhşi heyvanlar yaşayar, tez-tez adamlara hücum edərmiş. Adamlar da məcbur olub, buradakı qayalıqlardakı kiçik oyuqları, mağaraları özlərinə sığınacaq yeri seçiblərmiş. Zaman keçdikcə çox şey dəyişdiyi kimi, Qaraqaya kəndinin adı da dəyişir. Sonralar bu kəndə Qəfərli, daha sonralar isə Mollalı adını verirlər.

Daha yırtıcı vəhşi heyvanlardan heç bir qorxu təhlükəsi olmayan, qayalıqların ətəyindəki dağlıq, təpəlik, çəmənzarlıqda bir gözəl və böyük kəndə çevrilən Mollalıda Atlıxan deyilən bir adlı-sanlı tayfa da yaşayarmış. Bu tayfanın tanınmış, hörmətli ağsaqqallarından birinin saqqalı qırmızı rəngə çaldığından, kənddə hamı ona öz adı ilə yox, ’’Qırmızısaqqal” deyə çağırarlarmış. Vaxt olur, bu nurani kişi Kəbəni ziyarətə gedir, ’’Hacı” adını qazanır. Geri qayıdanda da oradan özünə bir qırmızı rəngli çuxa alıb, geyinir. Kənd adamları bu dəfə onu nə ’’Hacı”, nə də ’’Qırmızısaqqal” yox, ’’Qırmızıçuxa” deyə çağırmağa başlayırlar.

Qırmızıçuxa oğluna toy eləyirmiş. Məsləhət bilir ki, toyu Miskin Abdal aparsın. Bu xəbər kənd adamlarını hədsiz sevindirir. Qırmızıçuxanın göstərişi ilə çapar bir yüyrək ata minib, Zərgərli (Sarıyaqub) kəndinə yola düşür. O, ”El yolu” adlanın dağlıq yolla dərələr keçir, təpələr aşır, Qırxbulaq kəndinin üst tərəfindən keçən ’’Qarnı yarıq yol’’dan gedib, gedib, nəhayət, Zərgərli kəndinə çatır. Qırmızıçuxanın xahişini Miskin Abdala çatdırır. Böyük ustad bu dəvətə ”yox” demir. Burada çox xətir-hörmət görən çapar xoş xəbərlə gəldiyi yolla da geri qayıdır. Toy evi Miskin Abdalın yolunu səbirsizliklə gözləyir. Müsəlmançılığın və şiəliyin yorulmaz carçısı olan Miskin Abdal aşıq

olmasa da, öz dini qayəsini adamlara çatdırmaq üçün bu cür el məclislərini, toy-nişan yığnaqlarını ən əlverişli fürsət bilirdi. Belə məclislər ondan ötrü göydəndüşmə idi. Ona görə də dəvət olunduğu yerə vaxtında çatır. İstər toy evinin adamları, istərsə də bütün kənd əhli və qonaqlar Miskin Abdalı böyük təmtəraq və el məhəbbəti ilə qarşılayır. Atlıxan tayfasının başbiləni Qırmızıçuxa sözünü yerə salmadığı üçün Miskin Abdala öz ağsaqqal razılığını bildirir.

Beləliklə, toy başlayır. Miskin Abdal gecənin bir vaxtına kimi çalır-çalır, şirin-şirin söhbət edir. Xoş məramını toy adamlarına çatdırır. Hamı da onun qabiliyyətinə, ağlına heyran qalır. Elə ki, toy qurtarır, Qırmızıçuxa elan edir ki, məni istəyən aşığa xələt versin. Əvvəlcə özü xeyli pul və hədiyyə qoyur. Sonra adamlar meydana o qədər xələt, nəmər tökür ki, gəl görəsən. Bunu görən Miskin Abdal əvvəlcə Qırmızıçuxaya, sonra isə məclis iştirakçılarına öz dərin hörmət və ehtiramını bildirir. Sonra puldan və bəxşişlərdən bir az götürüb, qalanının toyun bəyi ilə xanımına ənam etdiyini bildirir. Evin sahibi bilirdi ki, Miskin Abdalda söz birdir. Ona görə də dediyi ilə razılaşmalı olur və bu gəncin alicənablığının qarşısında hamı baş əyir. Səhərə az qalsa da, Miskin Abdal yatmalı olur. O, yuxusunu qatır. Görür ki, gözəl bir çəmənlikdədir, təzəcə evləndiyi Sənubər də onun yanındadır. Gəzlənilmədən birdən-birə toz-duman qalxıb, onları bürüyür. Miskin Abdal nə qədər axtarırsa, bu toz-dumanın içində Sənubəri tapa bilmir. Qəlbi təlaşlı yuxudan ayılır. Örtünün içində bir xeyli o yana bu yana çevrildikdən sonra paltarını geyinib, ayağa qalxır. Xəyalına hər cür qara fikirlər gəlir. Bu qarışıq fikir-xəyalla bayıra çıxır. Artıq hava

işıqlanıbmış. Bu vaxt ətrafdakı quşlar Miskin Abdalın başının üstündə uçuşub səs salmağa, qağıldaşmağa başlayır. Quşların bu hərəkətindən Miskin Abdalın tükü ürpəşir, özündə bir sarsıntı duyur. Quşların səsinə bayıra çıxan Qırmızıçuxa və digər adamlar bu mənzərəni görüb, mat qalırlar. Xəyalı çaşqın Miskin Abdal üzünü sonsuz göylərə tutub, ucadan deyir: ”Ya bir Allah, ya Məhəmməd, ya Əli”. Sonra isə eyni məzmunlu şeiri qəmli-qəmli çalıb-oxuyur.

Bunu görən Qırmızıçuxa Miskin Abdaldan nə baş verdiyini soruşur. Miskin Abdal da gördüyü yuxusunu danışır. Bunu eşidənlər bikef olurlar. Qırmızıçuxa da, ora toplaşan adamlar da Miskin Abdala səbr diləyir, əllərini göylərə açıb, ona kömək istəyirlər. Miskin Abdal içəri keçir ki, dərdini bir də sazına desin. Nə qədər edir, saz dillənmir. Bunu görənlər lap mat qalırlar. Miskin Abdalın tələbi ilə saza qırmızının əvəzinə qara köynək tikilir. Qırmızıçuxa qara köynəyin üstündən qırmızı parça bağlayır. Yəni bu onu bildirirdi ki, sazın sahibi sağdır, ancaq kədər içindədir.

Miskin Abdal evə qayıtmağa tələsir. Qırmızıçuxa onun yanına pəhləvan cüssəli iki cavan qoşur. Deyir ki, yolda olmaz-bilməz, kimsə cavanlıq edib Miskin Abdala saz çaldırmaq istəyər, narazılıq yaranar. Ona görə də Atlıxanın nəslindən olan Qırmızıçuxa oğlanlara tapşırır ki, Miskin Abdalı sağ-salamat Zərgərliyə çatdırsınlar, tez də bir xoş xəbərlə qayıtsınlar.

Bunlar yola düşmək istəyirmişlər ki, bir də görürlər, toy qapısına bir atlı qonaq gəldi. Özü də qanı yaman qaradır. Çırtma vursan, qanı damar. Bu atlı Miskin Abdalgilin qonşusu imiş. O, qısa salam-kalamdan sonra Miskin Abdala yaxınlaşıb deyir: ’’Atan Məhəmməd kişi tapşırdı ki, tez evə qayıdasan”. Mis-

kin Abdal nə qədər soruşur ki, axı nə olub? Oğlan bu sözdən başqa heç nə demir. Miskin Abdalın halı lap pərişan olur. Qırmızıçuxa öz tərəfindən olan atlılara deyir: ''Bərabər gedərsiniz, bizə tez bir xəbər çatdırarsınız".

Miskin Abdal qabaqda olmaqla atlılar yola düşürlər. Quşlar da onların başlarının üstüncə uçur. Bu vaxt haradansa durna qatarı da bu dəstəyə qoşulur. Onlar qəmli-qəmli oxuyur, atlılar isə dördnala çapırdılar. Onlar dağlar qoynundan keçən "El yolu"nu, ''Qarnı yarıq yol''u arxada qoyub, Zərgərli kəndinin "Qaş" deyilən dikinə çatırlar. Dərənin içində olan kənd buradan ap-aydın görünürdü.

Miskin Abdal görür ki, həyətə çoxlu adam toplaşıb. Özü də yaman ağlaşma, ah-vay səsləri gəlir. Bu səsləri eşitdikcə adamın tükü ürpəşir. Quşların da ki, səs-küyü, qığıltısı, durnaların qəmli səsləri də aləmi başına götürüb. Miskin Abdal yəqin etdi ki, ölən var, özü də Sənubərdir.

Atlılar bir su içimində qapıya çatırlar. Məlum olur ki, evin bir neçə aylıq gəlini olan Sənubər qaynanası xəstə olduğundan, kərmə qalağından təzək gətirməyə gedibmiş. Qalağın içinə girib, «bir-iki təzək çəkim» deyəndə, yuxarıdan bir neçə iri kərmə düşür onun başına. Bu ağır zərbədən özünü itirən Sənubər güclə bayıra çıxır və canını Allaha tapşırır.

Bunu eşidən atlı qonaqlar vaxt itirmədən geriyə at çapır, bu acı xəbəri Qırmızıçuxaya çatdırırlar. Miskin Abdalın da ahı-naləsi ərşə dirənir.

Fələkdən inciyib-küsən Miskin Abdal ikinci dəfə əlli yaşında evlənir. Onun Həlimə adında ikinci arvadından dörd övladı olur: Şadman, Məleykə, Əli və Həsən. Sonrakı iki uşağı Dağıstan dağlarında boranda ölür. Şadman və Məleykə isə uzu-

nömürlü olurlar.

Miskin Abdal dünyasını dəyişdikdən sonra oğlu Şadmanın adına – ’’Şadmanlı”, qızı Məleykənin adına – ’’Ocaqlı” tayfaları qalır.

* * *

Belə rəvayət edirlər ki, Miskin Abdalın ocağına qeybdən marallar sağına gələrmiş. Bir gün marallardan biri Miskin Abdalın evinin dalındakı hündür qayalığın dibində dayanıb, qalır. Bunu görən arvadı maralın durduğu yerə qalxır ki, görsün, marala nə olub, qapıdan niyə perik düşüb, sağına niyə gəlmir. Bu ərəfədə Miskin Abdal da əlində aftafa həyətə çıxırmış. O, arvadının qayaya doğru getdiyini və ana marallardan birinin qayada qaldığını görür. Arvadı marala çatır, baxıb görür ki, maralın başı qayalıqdakı daşların arasında bitən otu-ormanı, gülü-çiçəyi yeməyə qarışıb. Elə də şirin-şirin yeyir ki, gəl görəsən. Bunu görən arvad hirslənir və marala qarğış edir. Qarğışı eşidən Miskin Abdal əlindəki aftafanı qəzəblə arvadına atır. Aftafa arvadına yox, bir iri daşa dəyib, yerə düşür. Bu vaxt bir möcüzə baş verir: aftafa dəyən daşın arasındakı yarıqdan su çıxmağa başlayır və nəhayət, daima axan qaynar bir bulağa çevrilir.

Yaranması bu gözəl rəvayətlə başlanan həmin çeşmə Miskin Abdal dünyasını dəyişdikdən sonra onun oğlu Şadmanın adı ilə adlanır. ’’Şadmanlıların bulağı” neçə yüz illərdir, gecəli-gündüzlü yorulmadan axır, axır, axır.

***“Ekspress” № 105,***
***06 iyun 2003-cü il***

## MİSKİN ABDAL VƏ CƏLLAD

Bu hekayəti mənə əslən Başkeçiddən olan şairə Səadət Buta belə danışdı:

– İkinci sinifdə oxuyurdum. Kəndimizdə toy idi. O vaxt el adətinə görə qadınların və qızların kişi məclislərinə getməsi qadağan idi. Mən saza-sözə, şeirə olan məhəbbətimlə necə olursa-olsun bu məclisdə olmağı qərara aldım. Qaranlıq düşəndə bir təhər xəlvətcə başı aşığın sazına-sözünə qarışmış kişilərin arasından sivişib keçib, bir küncə qısılıb, həsrət-həsrət aşığa qulaq asmağa başladım. Aşıqlar axşamdan başlamış, ta səhərəcən Şah İsmayıl Xətaidən və Miskin Abdaldan danışdılar. Yadımda qalan ən şirin və maraqlı söhbətlərdən biri belədir.

Şah İsmayıl Xətainin Miskin Abdala xüsusi, bənzərsiz hörməti və rəğbəti var imiş. Miskin Abdal da həmin hörmətlə Şah İsmayıl Xətaini – Şeyx Heydər oğlu şair İsmayılı çox sevərmiş. Bu qaynar sevgini yaradan Miskin Abdalın təkcə böyük dövlət və din xadimi olmağı, diplomatiya bacarığı, Azərbaycanın saz-söz sənətinin inkişafındakı müstəsna rolu olması, şairliyi, müəllim və müdrik el ağsaqqalı kimi keyfiyyətləri deyildi. Həm də onların dostluğunun əzəli Miskin Abdalın ulu babası Yaqubla Şah İsmayılın ulu babası Şeyx Heydərin yaxın dostluq münasibətlərinə gedib çıxırdı. Nəsil-nəsil davam edən və möhkəmlənən bu dostluğun məğzi yaxın-uzaq məkanda dinin təbliğinin genişləndirilməsi və gücləndirilməsi idi. Bu sahədə Miskin Abdalın müstəsna rolu var idi. O həm də müqəddəs sayılan ocaq sahibi idi.

Azərbaycan dövlətçiliyinin möhkəmlənməsində və Səfə-

vilər tərəfindən təbliğ edilən dini təriqətin yayılmasında öz dəsti-xətti olan Miskin Abdal əlində saz, haradansa el şənliklərindən Təbrizə qayıdırmış. Aşıq olmasa da diyar-diyar gəzib həm Azərbaycan saz-söz sənətinin, həm də müsəlmançılığın genişləndirilməsində yorulmaq nə olduğunu bilməyən, yaşı doxsanı haqlamış bu müdrik el ağsaqqalı yolu piyada gəldiyindən, şəhərin kənarında bir xaraba qalmış evin uçuq-sökük divarının dibində oturub dincini alırmış. Bu vaxt buradan təsadüfən keçən saray cəlladı Miskin Abdalı görüb, atının başını döndərib, ona tərəf sürür. Cəlladı görən Miskin Abdalın qanı bərk qaralır. Onun gəlişinə əhəmiyyət vermir. Cəllad atını Miskin Abdalın qənşərində saxlayıb, deyir:

– Salam, aşıq.

Miskin Abdal cəlladın salamını almır və başını qaldırmadan deyir:

– Cəllad, bilmirsən ki, mən aşıq yox, şairəm?

Salamının alınmadığını görən cəllad pərt olur. Lakin, özünü o yerə qoymur. Əli ilə yaxınlıqdakı bağ-bağatlı yerləri, gözəl-göyçək evləri göstərib, deyir:

– Əgər şairsənsə, niyə o çəmənzarlığı, gözəl evləri qoyub, gəlib bu xarabazlığın bir küncündə oturubsan. Şair gözəlliklərin tərənnümçüsü olmalıdır.

Miskin Abdal özünəməxsus kinayə və eyhamla deyir:

– Cəllad, vaxt gələcək hər gün baş kəsdiyin, qan tökdüyün zər-zibalı, çil-çıraqlı sarayların da axırı belə olacaq. O göstərdiyin çəmənzarlıq da müvəqqətidir. Dünyada bir əbədi, solmayan, ətirli çəmənzarlıq var – o da söz gülüstanıdır.

Cəllad özü də bilmədən yavaş-yavaş Miskin Abdal müd-

rikliyinin sehrinə düşürdü. Sözlər onu iynə kimi deşirdi. Lakin məğlub olmaq istəmirdi. Miskin Abdalı kövrəltmək məqsədi ilə deyir:

– Şair, eşitmişəm ata-baba vətənin Qədim Göyçə mahalı gözəllik mahalıdır. Belə gözəl torpaqdan ayrı düşmək sənə çətin deyilmi?!

İndi daha şax və vüqarlı görünən Miskin Abdal:

– Mənə görə həmişə dünyanın gözəllik nümunəsi olan Azərbaycanımın hər qarışı vətəndir.

Cavablardan çaş-baş qalan cəllad söhbətin səmtini dəyişdirmək istəyir:

– Şair, mənə bir saz havası çal!

Miskin Abdal qəzəbli nəzərlə deyir:

– Çalmaram!

Cəllad elə başa düşür ki, Miskin Abdal pul istəyir. O, şəstini sındırmamaq üçün əlini cibinə çalıb, pul çıxardır və Miskin Abdala tərəf uzadıb deyir:

– Al pulu, mənə bir saz havası çal.

Miskin Abdal daha kəskin eyhamla:

– Dedim ki, çalmaram!

Bu dəfə cəllada elə gəlir ki, şair pula azımsınır:

– Nədir? Bir saz havası üçün mən sənə nə qədər pul verməliyəm?!

– Cəllad, sən mənə dünyanı bağışlasan da mən sənə saz çalmaram. Sən cəlladsan, baş kəsənsən, qan tökəsən! – deyir.

Miskin Abdalın bu cavabı cəlladı ildırım kimi vurur. Onun bütün varlığı silkələnir. Elə bil, dünya başına dar gəlir. Az qa-

lır hirsindən gözlərinə qaranlıq çöksün. Söz yarasının qılınc yarasından betər olduğunu cəllad anlayır, vücudu əsim-əsim əsir. Bu cavabı nə çeynəmək, nə udmaq olurdu. Onun kəsəri getdikcə cəlladı sarsıdırdı. İndi özünü alçalmış adam kimi hiss edən cəlladın ağlına nəsə gəldi. Acıqlı-acıqlı Miskin Abdala dedi:

– Şair, sən doğrudan da ədalətlisənsə, ölümlərə bu qədər kin və küdurətin varsa, onda bəs niyə kimsənin ölümünə fərman verən şaha saz çalırsan, onu yerinə yetirən cəllada yox? Hələ onun adına neçə-neçə saz havası qoşduğunu demirəm.

Söz gülüstanının bağbanı olan Miskin Abdal təmkinlə deyir:

– Cəllad, qulaqlarını aç, yaxşı-yaxşı eşit. Mən heç vaxt Şah İsmayıl Xətaiyə saz çalmamışam. Mən sazı Şeyx Heydər oğlu şair İsmayıla çalmışam. Bunu eşidən cəlladın gözləri bərələ qaldı, elə bil yerindən çıxacaqdı. Bayaq divarın dibində oturmuş bir qoca birdən-birə onun gözlərində böyüdü, böyüdü. O, Miskin Abdalın müqəddəs bir ocaq sahibi olduğunu bilirdi. Onun haqqında xalq arasında dildə-dodaqda neçə-neçə heyrətamiz söhbətləri var idi. O, özünü atın üstündə dünyadan təcrid olmuş vəziyyətdə bilə-bilə belə söhbətlərdən bir neçəsini xatırladı:

”Deyirlər, Miskin Abdalın ocağına marallar sağına gələrmiş. Bir gün arvadı ocaqda bişən südün qan kəsdiyini ərinə deyir. Miskin Abdal:

– Arvad, oğlum Şadman ölsün! Yəqin adam öldürdü.

Bir azdan Şadman gəlib evə çıxır. O doğurdan da atasının mal-qarasına, ilxısına basqın edən quldur-qaçaqlardan öldür-

düyünü deyir. Bunu eşidən Miskin Abdalın hirsindən əlindəki çəliyi burum-burum olur. O, hirsli-hirsli ocaqdan bir höyüş kösöv çəkib, qeyzlə oğlu Şadmana atır. Kösöv Şadmana çatmamış yerə sancılır, qol-budaq atır, yanıq bir qara armud ağacına çevrilir.”

’’Deyirlər, bir dəfə Qızılbaş şahının qoşununun yeməyi tükənir. Miskin Abdal pis vəziyyətdə olan şaha yaxınlaşıb qoşunu yedizdirməyə icazə istəyir. Bunu eşidən şah xeyli təəccüblənir və qeyri-ixtiyarı icazə verir. Eşitdiyinə inanmayan Şah İsmayıl Miskin Abdalı izləyir. Görür ki, Miskin Abdal özündə olan bir badya qatıqdan və bir kömbə çörəkdən bir-bir hamıya payladı və xeyli də artıq qaldı. Bunu görən şahı heyrət götürür.”

Cəllad güclə xəyallardan ayıldı. Bir təhər atdan düşdü. Qamçısı ilə atını şallaqlayıb, bərri-biyabana buraxdı. Dəli kimi qılıncını daşlara çırpıb, əzik-üzük edib, gücü gəldikcə uzaqlara tulladı. Göz yaşlarını sel kimi axıdan cəllad Miskin Abdalın ayaqlarına döşənib yalvarmağa başladı:

– Ey müdrik insan, yalvarıram, əl aç sonsuz göylərə, ulu Tanrıdan mənə rəhm dilə. Daha mənə cəllad demə! Daha mən cəllad deyiləm! Məni bağışla.

Miskin Abdal əlini atıb, halı özündə olmayan gözü yaşlı cəlladı yuxarı qaldırıb, deyir:

– Yüz ağlasan da, sızlasan da, yalvarsan da, keçməz! Sən cəlladsan, baş kəsənsən, qan tökənsən.

Miskin Abdalın bu sözlərini yenidən eşidən və ümidsizliyə qapılan cəllad dəli kimi onun əlindən çıxıb, çöllərə, dağlara üz tutur, var gücü ilə qışqırır:

– Mənə cəllad demə, daha mən cəllad deyiləm!

Getdikcə cəlladın özü kimi dəhşətli yalvarış nidaları da yox olur. Onun düşdüyü bu hala acıyan Miskin Abdal torpağa diz çöküb, üzünü göylərə tutub, ulu Tanrıdan cəlladı bağışlamağı diləyir.

Bu hadisədən sonra birdən-birə saray cəlladının yoxa çıxması hamını təəccübləndirir. Bu nigarançılığı aradan qaldırmaq üçün Miskin Abdal cəlladla olan əhvalatını Şah İsmayıl başda olmaqla, saray əyanlarına danışır. Hamını heyrət götürür. Miskin Abdal müdrikliyi onları ovsunlayır. Qızılbaşlar şahı bu söhbətdən çox xoşhal olduğunu bildirir. Yerindən addım-addım Miskin Abdalın bərabərinə gəlir, məna dolu gözlərini üzündən nur yağan bu qocadan çəkməyib deyir:

– Ustad, sənin danışdığın bu söhbət məni heyran etdi. Hələ indiyəcən eşitmədiyim ağıllı kəlamları eşitdim. Görəsən, bundan da uca müdriklik varmı!? Bu söhbətin mənim varlığımı riqqətə gətirdi. Bu müdrikliyin qiyməti qızıl-gümüşlə, qaş-daşla, ləl-cəvahirətlə müqayisə edilə bilməz. Cüzi də olsa, xəzinələrin açarlarını sənə verirəm, nə qədər istəyirsən götür. İmtina etmə, ya Şah İsmayıl Xətainin şərəfinə, ya da Şeyx Heydər oğlu şair İsmayılın hörmətinə. Miskin Abdal daha böyük qürurla və vüqarla deyir:

– Hər iki halda, aləm bilir, sənə sonsuz hörmətim və məhəbbətim var. Bu sevgini Tanrı özü verib. O ki qaldı, mənə vermək istədiyin bütün xəzinələrin açarına, bundan imtina etməyimə incimə. Günki, xəzinəni daşıyıram, paylayaram, qurtarar, lakin sənin müdrikliyə verdiyin qiymət tükənməz bir xəzinədir. Bun-

dan böyük ənam ola bilərmi?!.

Bu sözü eşidənlərin heyrətindən kirpikləri də tərpənmirdi. Tək Qızılbaşlar şahından savayı. Şah İsmayıl Xətai – Şeyx Heydər oğlu şair İsmayıl özündən asılı olmayaraq, Miskin Abdalı yüz ilin ayrısı kimi həsrətliklə qucaqlayıb, bağrına basdı. Sonra ucadan və sinə dolu məhəbbətlə dedi:

– Hələ, Göyçənin məğruru, ehtişamlısı bir yana, Miskininə də alqış, Abdalına da alqış! Min alqış!!!

***”Maarifçi” qəzeti, № 36,***
***25 noyabr 1998-ci il***

## Seyyid Miskin Abdal mənəm, söz mənim, meydan mənim

Hüsevn İsmayılov:

”Miskin Abdal deyəndə göz önündə üzündən nur yağan, şah vüqarlı, əzəmətli bir insan dayanır. Onu ancaq dünyanın böyük şəxsiyyətləri ilə müqayisə etmək olar. Bir çox yüksək keyfiyyətlərə malik bu ulu ustad həm də Azərbaycan aşıq, saz – söz dünyasında öz ölməz dəsti-xəttini qoymuşdur. O, dağınıq və pərakəndə ozan-aşıq, qopuz-saz sənətində yeni bir eranın müəllifinə çevrilmişdir. Ümumiyyətlə, bu günkü aşıq-

saz sənətindəki böyüklüyə, əzəmətə görə bu ulu ustada borcluyuq.”

***<u>Nagif Süleymanov:</u>***

”Bu gün Miskin Abdal haqqında ən çox yayılan rəvayət oğlu Şadman adam öldürdüyünə görə ocaqda bişən maral südünün qan kəsməsi və atanın qəzəbidir. Atam Əbülfət öz atası Məsimalıdan eşitdiyi bu rəvayəti belə danışırdı ki, şahsevənlərdən bir dəstə quldur hələ Miskin Abdal sağ ikən onun müqəddəs ocağını oğurlamaq qərarına gəlir. Onlar Göyçə elinə çatar-çatmaz sözləri çəp gəlir, aralarına nifaq düşür, bir-birlərini qılıncdan keçirirlər. Ölənlər ölür, sağ qalanlar, buradan qaçıb, uzaqlaşır. Sağ qalan quldurlar ikinci dəfə Miskin Abdalın yaylaqdakı ilxısına, mal-qarasına hücum edirlər. Həmin gecə Miskin Abdalın oğlu Şadman oğru-quldurların xeylisini qılıncdan keçirir. Sağ qalanlar da vəba xəstəliyinə tutulub qırılırlar.”

***<u>Əhməd Məmmədov:</u>***

’’Adam öldürdüyünə görə ocaqda bişən maral südünün qan kəsməsi, atanın qeyzlə oğluna atdığı ağacın yerə sancılıb, qol-budaq atması Miskin Abdal ruhunda olan təmizliyin, paklığın oğlu Şadmanda da olması hadisəsi ulu Yaradan tərəfindən möcüzəli təzahürün məntiqi nəticəsi deyilmi?!”

***<u>Əli Behbudoğlu:</u>***

”İlk məhəbbət oxu daşa dəyən Miskin Abdal ikinci dəfə 50 yaşında evlənir. Onun Şadman, Məleykə, Əli və Həsən adında

dörd övladı olur. Sonrakı 2 uşağı Dağıstan dağlarında boranda ölür. Şadman adam öldürdüyünə görə müqəddəs ocağın bacısı Məleykəyə verilməsi kənddə Miskin Abdalın adı ilə bağlı ”Şadmanlı” – oğul və ”Ocaqlı” – qız tayfalarının yaranmasına səbəb olur. Anam ”Ocaqlı” tayfasının qızıdır. Adını da Miskin Abdalın qızının adını qoyublar – Məleykə. Anam da mənə Miskin Abdalın oğlu Əlinin adını qoyub. Hər iki ad ailəmizin fəxridir.”

***Səhman İsgəndərov:***

”Yaxşı yadımdadır. Orta məktəbdə oxuyarkən ədəbiyyat müəllimimiz Musa Bayramov kəndimizin qədim adının nə olduğu barədə bizə sual verdi. Heç birimiz bilmədik. Özü sözə başlayıb kəndimizin qədim adının Zərgərli olduğunu, XIX əsrdə Sarı Yaqub kimi tanınan Yaqub Ağanın şərəfinə Sarıyaqub adlandırıldığını geniş izah etdi.”

***Abbas Mazanov:***

”Şah İsmayıl Xətai Miskin Abdalı sazın, sözün şahı, hökmdarı kimi tanıyırmış.”

***Tofiq Hüseynzadə,***
***”Palitra” qəzeti 23 yanvar 2001 № 8(162)***

# MİSKİN ABDAL VƏ ONUNLA BAĞLI HƏQİQƏTLƏR

’’Neçə əsrdir ki, ’’Miskin Abdal ocağı” adamların ümid, imdad yeridir. Onu çağıranlar heç vaxt darda qalmayıblar. Onun adı, nəfəsi həmişə adamların harayına çatıb, müqəddəsliyi, möcüzəliyi ilə unudulmaz and yerinə çevrilib. Belə möcüzələrdən bir neçəsini xatırlatmaq maraqlı olar:

Kənddə bulaq yox idi. Adamlar içməli su sarıdan korluq çəkirdilər. Kənddən axan çay isə camaatın tələbatını ödəmirdi. Camaatın narahatlığını hiss edən Miskin Abdal deyir:

– Allahın qüdrəti və qüvvəti qarşısında hər şey acizdir!

Aradan bir neçə gün keçir. Gecəyarı tufan başlayır, bərk ildırım çaxır. İldırım Miskin Abdalın yaşadığı evin arxasındakı nəhəng qayanı dağıdır.

Səhər açılanda hamı hadisə yerinə toplaşır. İri qaya parçalarının Miskin Abdalın yaşadığı evə heç bir ziyan vermədiyini görüb mat qalırlar. Onları heyrətləndirən isə dağılmış qayanın altındakı iri bir daşın ortasından süzülən dupduru su idi.

Möcüzədən yaranmış bu bulaq nə yayın qızmar günlərində, nə də yağışlı günlərdə öz təbii ahəngini pozmamış, o, həmişə kənd adamlarının həyat çeşməsi olmuşdur.

“Şadmanlıların bulağı” indi doğmalarına həsrətdən göz yaşı axıdır. Yəqin ki, vaxt gələcək, Miskin Abdal yurduna, ocağına bir də dönəcəyik, onun zəhmindən qaynayan bulağın aydınlıq suyundan bir də içəcəyik...”

”Şadmanlıların bulağı”nın dibində boy atan ağacın dibində müqəddəs günlərdə gecələr şam yanarmış. XX əsrin başlan-

ğıcında bir naxələf şəxs, deyilənləri eşitməyərək, bu ağacı kəsib, odun edir. Bir il ötməmiş həmin ailədən ancaq bir xarabalıq nişanə qalır.

...Erməni-müsəlman davalarında həmişə ''kəndin qaşı"ından düşmən tərəfdən kəndə top-tüfəng güllələri yağdırılsa da heç kəs tələf olmamışdı.

...1985-1987-ci illərdə isti yay günlərinin birində günortadan bir az keçmiş, səma tam açıq ikən kənddən keçən çay yuxarıdakı dağlarda yağan ''qara leysan"ın təsirindən birdən-birə səviyyəsini bir neçə metr qaldırdı. Çay hər iki sahilə doğru 25-35 metr sürətlə irəlilədi. Bu, adi sel deyildi. Bu, o vaxtadək heç kəsin görmədiyi və ağlına belə gətirmədiyi bəla idi. Onlarca yurd-yuva yox olar, adamlar ölə bilərdi. Hamı Allahı, Miskin Abdalı köməyə çağırırdı. Bir-birini təkrar edən bu bəlalar da itkisiz sovuşdu.

...1988-ci ildə Göyçədə erməni qovhaqovu da qansız-qadasız keçmədi. Bu hadisə ilin qış fəslində başlasa da, o il heç qışa bənzəmədi. Miskin Abdal öz imdad şahpərini, elə bil, hamının üstünə çəkmişdi."

***Tofiq Hüseynzadə, ''Ulu Göyçə'' qəzeti,***
***13 oktyabr 1993-cü il, № 25***

# “MİSKİN ABDAL OCAĞI”NDAKI ƏŞYALAR VƏ SƏNƏDLƏR

’’Miskin Abdal ocağı”ndakı qiyməti əşyalar və tarixi sənədlər bunlardır: üzərində ay və səkkigüşəli ulduz təsviri olan möhür daşı, ’’Haçadil” atının bədnəzər duası, əl əsası, cannamazı, qələmdanı və qələmləri, çuxası, sənədləri saxlamaq üçün taxta mücrü, müxtəlif tarixi və adi sənədlər, sənədlərin Səfəviyyə təsdiqləməsi, xörək yediyi taxta qab, ağacdan düzəldilmiş kiçik təknə, İrəvan xanlığı qazisinin şəhadətnaməsi, ”Qurani-Kərim”dən müxtəlif xətt üslubları ilə yazılmış dualar, müxtəlif zamanlarda Məkkədən, Mədinədən və Məşhəddən qiymətli və əziz xatirə kimi gətirilən müxtəlif dini hədiyyələr və digər müxtəlif əşyalar...

* * *

Taleyinə dəfələrlə qaçqınlıq qismət olan “Miskin Abdal ocağı” hazırda Goranboy rayonunun Qaradağlı kəndindədir. ”Ocağ”a “Ocaq”lı tayfasının nümayəndəsi Nəsib Hüseynov ağsaqqalıq edir.

# MİSKİN ABDALIN HƏLƏLİK MƏLUM SAZ HAVALARI

Miskin Abdalın yaratdığı çoxsaylı saz havalarından, hələlik, bizə məlum olanları bunlardır: ”Şah divani” (”Baş divani”), ’’Osmanlı divanisi” (’’Ayaq divani”), ”Şah qalxdı”, ”Şah İsmayıl gəraylısı”, ”Şah sarayı”, ’’Şahsevəni”, ’’Heydəri”, ’’İsmayılı”, ’’İrvahamı”, ’’Sultanı”, ’’Miskini”, ’’Abdalı”, ’’Sənubəri”, ’’Hüseyni”, ’’Dərbəndi”, ’’Göyçə gözəlləməsi”, ’’Göyçə çuxuru”, ’’Göyçə döndərməsi”, ’’Göyçə şikəstəsi”, ’’Göyçə gülü”, ’’Atlandırma”, ’’Paşa köçdü”, ’’Misri”, ’’Oxşarı”, ’’Yedəkləmə”, ’’Dərvişi” və sairə...

Miskin Abdal həm də sazın dördüncü pərdəsini Şah İsmayılın şərəfinə ”Şah pərdə” adlandırmışdır.

# BİR DƏFƏ...

1999-cu ilin yay ayları idi. Azərbaycan Respublikası Elmlər Akademiyası Nizami adına Ədəbiyyat İnstitutunun Folklor Elmi-Mədəni Mərkəzində söhbət edirdik. Bu vaxt Institutun direktoru, filologiya elmləri doktoru, professor, əməkdar elm xadimi, gözəl insan Yaşar Qarayev içəri daxil oldu. Hamı ilə səmimi salamlaşıb görüşdü. Söhbətin nədən, haradan, kimdən getdiyini maraqlandı. Mərkəzin müdiri, filologiya elmləri namizədi, dosent Hüseyn İsmayılov filologiya elmləri namizədi, professor, tanınmış folklor tədqiqatçısı Sədnik Paşayevin ''Ulduz" jurnalının 1985-ci il tarixli, 7-ci nömrəsində Miskin Abdal haqqında çap olunmuş yeni elmi-tədqiqat yazısı və oradakı bəzi şeirlərindən nümunələri haqqında söhbət getdiyini bildirdi və mənim həmin nəsildən olduğumu dedi. Söhbətə marağını gizlətməyən direktor, jurnalda Miskin Abdal haqqında nə yazıldığını soruşdu. Mən direktoru yazının ümumi məzmunu ilə tanış etdim. Əməkdar elm xadiminin marağı daha da çoxaldı. Axırda jurnalda çap olunmuş şeirlərdən bu misraları oxudum:

**«Şahım, nə yatıbsan, dünya xarabdır,**
**Haqq özü yatmayıb, ayaq üstədir».**

Bu misralar Yaşar Qarayevi heyrətə gətirdi. Dərhal dedi:
– O şeiri yaz, mənə ver.
Sonra əlavə etdi:
– Sözdəki hikmətə bir bax!

Hüseyn İsmayılov söhbətə qarışdı:

– Yaşar müəllim, Sizcə bu müdrik sətirlər, doğrudanmı Miskin Abdalındır?

Tanınmış akademik özünəməxsus qürurla belə dedi:

– Hüseyn müəlim, bu cür müdrikliyi Miskin Abdaldan savayı kim deyə bilərdi?! Bunlar adi şeir sətirləri yox, böyük bir fəlsəfədir. Belə fəlsəfələr isə Miskin Abdal kimi nadir filosofların ağlının məhsulu ola bilər.

Sonra üzünü mənə tutub, dedi:

– Ulu baban olan böyük ustad haqqında kitab çap etdirmək haqqında fikirləşmirsən?

Mən dedim:

– Hörmətli Yaşar müəllim, buna mənim maddi imkanım yoxdur.

O dedi:

– Bu sənin işin deyil. Sən kitabı çapa hazırla. Sonrakı bizim işimizdir. Özüm də kitabın elmi rəhbəri olacağam.

Sonra üzünü Hüseyn müəllimə tutub, dedi:

– Kitabın çapı üçün lazım olan maliyyə sənədlərini hazırla gətir, imzalayım. Miskin Abdalın adına mütləq kitab çap olunmalıdır.

Nəhayət, 2001-ci ildə Nizami adına Ədəbiyyat İnstitutu Elmi Şurasının qərarı ilə Hüseyn İsmayılovun topladığı materiallar əsasında çap olunmuş bu kitabın elmi redaktoru, özünün dediyi kimi, görkəmli alim Yaşar Qarayev idi.

* * *

1999-cu ilin baharı idi. Respublika Dini İşlər üzrə Komitənin məsul işçisi, əslən Qərbi Azərbaycanın Hamamlı bölgəsində-

ki Saral kəndindən olan Mustafa İbrahimovla görüşmək üçün Hökümət evinə yanaşdım. Birinci mərtəbədə onun iş otağında görüşdük. Məni çox səmimiyyətlə qarşıladı. Gəlişimin məqsədini biləndə çox sevindi. Miskin Abdal kimi bir böyük din xadiminə, bu nadir tarixi şəxsiyyətə həmişə böyük hörməti olduğunu bildirdi və onun doğrudan da Qərbi Azərbaycanda daha çox sevildiyini dönə-dönə dedi və sonra bunları əlavə etdi:

– Bu böyük, tarixi, təkrarsız və bənzərsiz şəxsiyyət onu qəlbən sevənlərin hamısının yenilməz qüruru və əbədi iftixarıdır. O, əbədi bir məşəl kimi həmişə saf və təmiz qəlbləri işıqlandırır. Hələ sağlığında ikən əfsanələşən bu adamın adı ilə bağlı saysız-hesabsız rəvayətlər yaranmışdır. Bu rəvayətlərdə təkcə onun böyüklüyü, əzəməti haqqında, həm də haralılığı barədə də bir-birinə ziddiyyət təşkil edən söz-söhbətlər yaranmışdır. Ancaq həqiqətin bir üzü var. Qətiyyətlə demək lazımdır ki, Miskin Abdalın anadan olduğu yer, məkan qədim Göyçə mahalının indiki Sarıyaqub kəndidir. Burada adicə bir məntiqə diqqət yetirmək kifayətdir. Belə ki, artıq məlum həqiqətdir ki, Azərbaycan aşıq sənətinin beşiyi Göyçədir. Ozanın aşığa, qopuzun saza çevrilməsinin müəllifi də Miskin Abdaldır. Diqqət edin. Çıraq yanınca ən gur işığı öz ətrafına yayır. Çıraqdan uzaqlaşdıqca işıq zəifləyir və nəhayət, görünməz olur. Azərbaycan aşıq sənəti də belədir. Göyçədən uzaqlaşdıqca ayrı-ayrı bölgələrdəki aşıq sənətindən bir zəiflik hiss olunur. Aşıq sənətinin ən qaynar nöqtəsi isə Göyçədir. Buraya çatanda özünü sözlü-nəğməli, sazın-sözün vətənində hiss edirsən. Bu təbii, bənzərsiz məntiqdən sonra Miskin Abdalın haralılığı barədə

lüzumsuz mübahisələr yaratmağa heç bir ehtiyac yoxdur. Yeri gəlmişkən, Göyçə aləmdə təkcə saz-söz sənəti ilə yox, həm də çoxsaylı qədim və zəngin el adətləri ilə də məşhurdur. Belə ki, yerli adamların milli geyimi, əkinçilik alətləri, zəngin xörək növləri, toy, nişan, bayram mərasimləri və digər üstünlükləri bu mahalın qədimliyindən xəbər verir.

Mənim Göyçə mahalına və bütün göyçəlilərə xüsusi hörmətim vardır.

Bu böyük din xadiminin dövlət səviyyəsində tanınmasına dəyər. Lazım gələrsə, mən buna çalışacağam.

* * *

1999-cu ilin 24 yanvarında ’’Respublika” qəzetində mənim imzamla ’’Miskin Abdal” yazısı çap olunmuşdu. Ertəsi gün redaksiyaya gedib, qəzetin baş redaktoru Teymur Əhmədova öz minnətdarlığımı bildirmək istədim. Baş redaktor məni gülərüzlə qarşıladı. Mən isə ona qəlbimdən keçən xoş sözlərimi dedim. Bundan razı qalan redaktor əyilib, yanındakı siyirmədən bir qəzet çıxardıb, mənə uzatdı və dedi:

– Al, saxla, gərəyin olar. Vaxtilə “Ədəbiyyat və incəsənət” qəzetinin 1989-cu il 11 avqust tarixli nömrəsində çap olunmuş bu yazının müəllifi də Abbas Mazanovdur.

Mən qəzeti əlimə alıb, dedim:

– Çox var olun, Teymur müəllim. Bu qəzetdən məndə var. Sonra əlavə etdim:

– Yaxşı, qoy iki dənə olsun.

O qəzeti tez əlimdən alıb, dedi:

Madam ki, səndə var, qoy bu da mənim olsun. Elə bilirsən ki, Miskin Abdalı təkcə sən sevirsən? O, hamının sevimlisidir. O cümlədən, mənim də. Belə şəxsiyyətlər tarixdə az-az tapılır. Onların barəsində nə qədər çox yazılsa, deyilsə, yenə də azdır.

Sonra əlavə etdi:

– Akademik Tofiq Köçərli bu səhər mənə zəng etmişdi. ’’Miskin Abdal” yazısından çox razı qaldığını bildirdi. Dedi ki, mən heç bilmirdim ki, böyük tarixi şəxsiyyət olan, xalqın sevimli oğlu Miskin Abdal haqqında bu qədər zəngin məlumatlar varmış.

* * *

2003-cü ilin noyabr ayında Miskin Abdal mövzusu ilə bağlı Azərbaycan Milli Elmlər Akademiyası İnsan Hüquqları İnstitutunda oldum. İnstitutun direktoru, siyasi elmlər doktoru, professor Rövşən Mustafayev məni gülər üzlə, mehribanlıqla qarşıladı. Qəbulda söhbətimiz uzun çəkdi. Mən Miskin Abdal haqqında danışırdım. O, isə heyranlıqla qulaq asır, arabir onu maraqlandıran suallar verirdi. Şah İsmayılın 1515-ci ildə Miskin Abdalın adına imzaladığı tarixi fərmanın fotosurəti professoru, lap heyrətə gətirdi. Axırda mənə dedi:

– Get, Miskin Abdal haqqında nə bilirsənsə, bir yerə topla, gətir bura. Belə müqəddəs şəxsiyyətlər barədə nə varsa, nə biliriksə hamısını xalqa çatdırmaq lazımdır. Bu elə-belə, təsadüfi adamlardan deyil. O, əvəzolunmaz tarixi şəxsiyyətdir. O, sənə, mənə və hamıya lazımdır. Sən tələs, gecikmə, İnstitut

onun kitabını hər zaman nəşr etməyə hazırdır. Tezliklə yolunu gözləyirik.

Aradan xeyli keçdi. Mən direktorun yanına doqquz aydan sonra getdim. Görüşə İnstitutun məsul işçilərini – Musa müəllimi, Sücəddin müəllimi və Mirzəağa müəllimi də dəvət etmişdi.

Rövşən müəllim təəccüblə üzümə baxıb, kinayəli-kinayəli soruşdu:

– Bu vaxta kimi harada idin?!

Dedim:

– Xəstələnmişdim.

Dedi:

– Xəstələnərsən, da, xəstələnməzsənmi?! Sən Miskin Abdal kimi bir tarixi şəxsiyyətin müqəddəs ruhunu bürüyən şər və böhtanları, qara qüvvələri dağıdıbsan. Eybi yoxdur. Hər şey arxada qalıb. Özündən muğayat ol. İnşallah, bir daha xəstələnməzsən. De görüm, dediklərimi yerinə yetiribsənmi, yəni kitabı çapa hazırlamaq olarmı?

Dedim:

– Bəli. Hər şey hazırdır.

Dedi:

– Onda, əhsən! – sonra yenə də Miskin Abdal şəxsiyyəti barədə ətraflı söhbət açdı və kitabın lazımi səviyyədə nəşri üçün işçilərinə mühüm göstərişlər və tapşırıqlar verdi.

(Lakin sonralar müəyyən obyektiv səbəblər üzündən kitabın burada çapı mümkün olmadı).

# MİSKİN ABDAL KİTABLARDA...

1. Əzizə Cəfərzadə: «Bakı - 1501". Bakı – 1981;
2. ''Aşıq Ələsgər". I cild, Bakı – 1972;
3. "El düzümləri – elat söyləmələri". Bakı – 1993;
4. "XIX əsr Göyçə aşıq mühiti". Bakı – 1997
5. ''Ağrı dağı qədər ağrılarım var" . Bakı – 1999
6. ''Göyçə kimi intizarda elim var" . Bakı – 1999
7. ''Azərbaycan şifahi xalq ədəbiyyatına dair tədqiqlər" 8-ci cild, Bakı - 1999
8. ''Azərbaycan şifahi xalq ədəbiyyatına dair tədqiqlər" 9-cu cild, Bakı – 1999
9. ''Azərbaycan folkloru antologiyası" (Göyçə folkloru). 3-cü cild, Bakı – 2000
10. ''Miskin Abdal" . Bakı – 2001
11. ''Sirli xəzinələrdən incilər" . Bakı – 2002
12. ''Göyçə dastanları və aşıq rəvayətləri". Bakı – 2001
13. H.İsmayılov ''Aşıq yaradıcılığı: mənşəyi və inkişaf mərhələləri". Bakı – 2002

# JURNALLARDA...

1. ''Azərbaycan". 1978, № 7. Q.Qəhrəmanova;
2. ''Ulduz". 1985, № 7. S.Paşayev;
3. ''Türk dünyası folkloru dərgisi". Türkiyə - 1998 (Bahar – 37);

4. ’Türk dünyası folkloru dərgisi”. Türkiyə -1998 (Son bahar – 39);

5. ’’Azərbaycan”. 1998, № 9. D.Gədəbəyli;

6. ’’Musiqi dünyası” Bakı-2000, №1 A.O.Kərimli;

7. ’’Dədə Qorqud” 2003, № 1 ”Saz və təsəvvüf” F.Baxşəliyev;

8. ’’Dirçəliş”. 2004/7. Tofiq Hüseynzadə.

# QƏZETLƏRDƏ...

1. Sədnik Paşayev: ’’Miskin Abdal”. ’’Tərəqqi” (Gədəbəy) 24 iyul, 1970;
2. Məmməd Aslan: ’’Miskinlərin ən məğruru”. ’’Ədəbiyyat və incəsənət” 30 noyabr 1974;
3. Abbas Mazanov: ’’Sarıyaqubdan başlanan yol”. ’’Ədəbiyyat və incəsənət” 11 avqust 1989;
4. Yaqub Babayev: ’’Miskin Abdalın söz gülüstanından”. “Kommunist” 18 aprel 1991;
5. Məcnun Göyçəli: ’’Miskin Abdal haqqında həqiqət” ’’Vətən səsi”. 15 avqust 1991;
6. Tofiq Hüseynzadə: ”Miskin Abdal və onunla bağlı həqiqətlər” . ”Ulu Göyçə” 5 oktyabr 1993;
7. Tofiq Hüseynzadə: ’’Miskin Abdal və onunla bağlı həqiqətlər”: ”Ulu Göyçə” 13 oktyabr 1993;
8. Zəki İslam: ”El şairi Miskin Abdal”. ’’Günaydın” 28 aprel 1998;
9. Zəki İslam: ”El şairi Miskin Abdal” ’’Günaydın” 1 may 1998;
10. İsrail Elsəs: ’’Miskin Abdal pir idi”. ’’Ağrıdağ” 27 may 1998;

11. Əli Behbudoğlu: «Tarixi şəxsiyyətlər – el şairləri – Miskin Abdal” «Vətən səsi” 24 iyul 1998;
12. Əziz Əhmədov: ”Şah İsmayılın fərmanları da Miskin Abdal haqqında həqiqətləri təsdiq edir”. «Günaydın” 18 avqust 1998;
13. Tofiq Hüseynzadə: ’’Miskin Abdal”. ’’Xalq qəzeti” 2 oktyabr 1998;
14. Tofiq Hüseynzadə: ’’Tarixdə qalan izlər”. ”Hər gün” 20 noyabr 1998;
15. Tofiq Hüseynzadə: ’’Miskin Abdal və cəllad”. ’’Maarifçi” 25 noyabr 1998;
16. Hüseyn İsmayılov: ’’Miskin Abdal Göyçəsinə dönərmi”. ’’Ədəbiyyat” 18 dekabr 1998;
17. Tofiq Hüseynzadə: ’’Miskin Abdal”. ’’Respublika” 24 yanvar 1999;
18. Məhəmməd Nərimanoğlu: ”484 yaşlı fərman” ’’Yeni Azərbaycan” 24 fevral 1999;
19. Tofiq Hüseynzadə: ”El şairi Miskin Abdal”. ’’Maarifçi” 24 mart 1999;
20. Hüseyn İsmayılov: ’’Miskin Abdal şəxsiyyəti və taleyi” ’’Ekspress” 13 aprel 1999;
21. ---//--- 14 aprel 1999 ---//---
22. ---//--- 15 aprel 1999---//---
23. ---//--- 16 aprel 1999---//---
24. ---//--- 17 aprel 1999---//---
25. ---//--- 19 aprel 1999---//---
26. ---//--- 20 aprel 1999---//---
27. ---//--- 21 aprel 1999---//---
28. Gülruba Kərimova: ’’Qürbətdə qalan Göyçə”. ’’Xalq qəzeti” 23 aprel 1999;

29. Mehdi Hüseynzadə: ’’Miskin Abdal”. ’’Azərbaycan müəllimi”, 6 may 1999;
30. Aqil Kəngərli: ’’Miskin Abdal şəxsiyyəti”. ’’Millət” 6 may 1999;
31. Aqil Kəngərli: ’’Miskin Abdal şəxsiyyəti”. ’’Millət” 11 may 1999;
32. Mehdi Hüseynzadə: «Azərbaycan şifahi xalq ədəbiyatına dair tədqiqlər”. ’’Xalq qəzeti” 25 iyul 1999;
33. Tofiq Hüseynzadə: ’’Göyçədən doğan Günəş Miskin Abdal”. «Haqq yolu” 7 iyul 1999;
34. Tofiq Hüseynzadə: ’’Göyçədən doğan Günəş – Miskin Abdal”. ’’Haqq yolu” 14 iyul 1999;
35. Tofiq Hüseynzadə: ’’Göyçədən doğan Günəş – Miskin Abdal”. ’’Haqq yolu” 21 iyul 1999
36. Tofiq Hüseynzadə: ’’Göyçədən doğan Günəş – Miskin Abdal”. ’’Haqq yolu” 28 iyul 1999;
37. Aqil Kəngərli: ’’Miskin Abdal portreti yaradılıb”. ’’Millət” 25 noyabr 1999;
38. Tofiq Hüseynzadə: ’’Cabbar Quluyev: ’’Miskin Abdal mənim şah əsərimdir” ’’Respublika” 08 dekabr 1999;
39. Saşa Əliyev: ’’Miskin Abdal böyüklüyü bir daha təsdiqləndi”. ’’Vətən səsi” 10 dekabr 1999;
40. Zərifə Bəşirqızı: ”Pir məqamına yüksələn şair”. ’’Xalq qəzeti” 10 dekabr 1999;
41. Zəki İslam: ’’Miskin Abdal – yeni sənəd, yeni rəsm”. ’’Günaydın” 15 dekabr 1999;
42. Hüseyn İsmayılov: ’’Paklığın və halallığın rəmzi – Miskin Abdal”. ’’Yeni Azərbaycan” 24 dekabr 1999;
43. Əli Behbud oğlu: ’’Miskin Abdal ilk dəfə portretdə”. ’’Azərbaycan müəllimi” 30 dekabr 1999;

44. Tofiq Hüseynzadə: ’’Miskin Abdal yaddaşlarda”. ’’Paritet” 9 yanvar 2000;
45. Tofiq Hüseynzadə: ’’Miskin Abdalla ”üz-üzə”. ’’Maarifçi” 23 yanvar 2000;
46. Gülrüba Kərimova: ’’Gedəcəyəm ayaq qalsa yalın da” «Xalq qəzeti” 8 fevral 2000;
47. Tofiq Hüseynzadə: ’’Miskin Abdal portreti”. ’’Ədəbiyyat” 2 iyun 2000;
48. Tofiq Hüseynzadə: ”Bir boy soykökü” ’’Naxçıvan” 28 iyul 2000;
49. Əli Behbud oğlu: ’’Miskin Abdal şəxsiyyəti və qüdrəti”, ’’Ekspress” 10 avqust 2000;
50. Tofiq Hüseynzadə: ’’Paklığın dan ulduzu – Miskin Abdal”. ’’Azad Azərbaycan” 18 avqust 2000;
51. Əli Behbud oğlu: ’’Hədəfdə Miskin Abdaldır” ”P.S.” 9 sentyabr 2000;
52. Ruqiyyə: ’’İllərin arxasında qalan həqiqət”. ’’Haqq yolu” 27 sentyabr 2000;
53. Əli Behbud oğlu: ’’Miskin Abdal: Qoruyanım, özün qoru xain dostlardan məni”. ’’Ekspress” 28 sentyabr 2000;
54. Əli Behbud oğlu: ’’Miskin Abdal: Qadir Mövlam, uzaq eylə bayquşdan, sardan məni”. ’’Paritet” 7 oktyabr 2000
55. Tofiq Hüseynzadə: ’’Hikmət sahibi Miskin Abdal”. ’’Palitra” 17 oktyabr 2000;
56. Tofiq Hüseynzadə: ’’Miskin Abdal dünyasından yeni soraqlar”. ’’Kaspi” 11 dekabr 2000;
57. Rizvan Əsədov: ”Bir yazı iki tayfanı üz-üzə qoyub”, ’’Hürriyyət” 14 dekabr 2000;
58. Tofiq Hüseynzadə: ’’Seyyid Miskin Abdal mənəm, söz mənim meydan mənim” ’’Palitra”. 23 yanvar 2001;

59. Əli Behbud oğlu: ’’Tarix ləkə götürmür”. ’’Ekspress” 31 yanvar 2001;
60. Tofiq Hüseynzadə: ’’Miskin Abdal ömründən yarpaqlar”. ’’Azad Azərbaycan” 9 may 2001;
61. Tofiq Hüseynzadə: ’’Miskin Abdal haqqında xatırlamalar”. ’’Palitra” 24 iyun 2001;
62. Qüdrət Piriyev: «Miskin Abdal”, ’’Xalq qəzeti” 23 yanvar 2002;
63. Tofiq Hüseynzadə: ’’Miskin Abdal ömrünün qızıl kitabı” 30 aprel 2002;
64. Məmməd Aslan: “Miskin Abdal çəkər qəmi” ’’Ekran-efir” 01 iyul 2002;
65. Tofiq Hüseynzadə: ”Söz incisi kitabı – «Miskin Abdal” ’’Ekspress” 02 iyul 2002;
66. Almaz: ’’Folklordan başlanan dünya – Göyçədən başlanan folklor”, ’’Xalq qəzeti” 27 aprel 2003;
67. Tofiq Hüseynzadə: ’’Miskin Abdaldan yeni tapıntılar”, ’’Ekspress” 06 iyun 2003.

***Tofiq HÜSEYNZADƏ***

# ŞADMAN

(poema)

Belə söyləyibdir bir ulu ustad:
İnci tək az olur nadir istedad.
Şeriyyət sənəti bəzəkli tacdır,
Şairəm, – deyənlər buna möhtacdır.
Şairlik sayılıb bir uca sənət,
Şeriyyət olubdur zəngin səltənət.
Sahib olmaq üçün bu səltənətə,
Layiq olmalısan gərək sənətə.
İndi köklənibdir şer üstə sazım,
Könlümdən keçir ki, poema yazım.
Mən şair deyiləm, yaxşı bilin siz,
Lakin boş vaxtlarım keçmir şeirsiz.
Müdam oxuyuram şah əsərləri.

Çatıb qaşlarını könül dilbəri,
Deyir ki, dayanma, sən də yaz, yarat,
Qoy könül nəğməni yaşatsın həyat.
Belə gözəllikdən alıb ilhamı,
Yazım bu dastanı, oxusun hamı,
Xalqımın bu şirin şeir dilində.

Görüm nə var, nə yox Göyçə elində.
Orda sənət də var, sənətkar da var,
Orda salamlayır hər qışı bahar.
Göyçənin lap ulu tarixi vardır,
Göyçə gözəlliyi hər qəlbə yardır.
Gözəllik heç zaman gəlməsin gözə,
Allahın adıyla başladım sözə.

## 1. P r o l o q

Salam, sən ey ulu, sonsuz kainat,
Salam, ey vafasız söylənən həyat,
Salam, bu dünyanın Ayı, ulduzu,
Salam, ömrümüzün nurlu gündüzü,
Salam, söz mülkünün xanimanına!..

Gün doğub şerimin asimanına.
Xəyalım yenə də bilməm hardadır...
Əlçatmaz, ünyetməz uzaqlardadır.
Fikrim qanad alıb ildırımlardan,
Sanki qaranlıqdan sökülmüşdür dan,
Xəyalım bir anda yarıb zülməti,
Gedir ta qədimə şimşəkdən iti.
Daima yaşayan bir həqiqət var,
Başımın üstündə əbədiyyət var.
Yoxdur Yer üzündə bu günkü bəşər,

Nə Adəm övladı, nə şeytan, nə şər,
Anamız sayılan Yer kürəsinin,
Önündə durmuşam, deyirəm: «Sənin
Sirrin bilinmədi, ey qoca dünya!»
Səsimə hay verir hər dağ, hər qaya.
Sonra seyr edirəm bütün aləmi,
Şair hazırlasın dəftər, qələmi,
Olsun bu dastanın ölməz ərəni.
Mən deyim, o, yazsın bu mənzərəni,

Baxıram, üzümə gülür kainat,
Gör necə gözəldir sevdiyim həyat.
Müşk-ənbər qoxulu dağlar, dərələr,
Insan övladına söyləmir nələr...
Göylərə uzanır hər qaya, hər dağ,
Özgə bir aləmdir bu dövran, bu çağ.
Dənizlər, ümmanlar təlatümdədir,
Bilinmir bu eşqin sirri nədədir.
Nura qərq eləyir Günəş torpağı,
Boylanır göylərə otu, yarpağı.
Ulduzlar gecənin bağrını yarır,
Ay da həsrət-həsrət yerlərə baxır.
Çaylar gecə-gündüz dolanıb, gedir,
Arabir kükrəyir, bulanıb, gedir.
Səs salır ətrafa əsən küləklər,
Döşənib torpağa güllər, çiçəklər.
Beləcə dolanıb, yaşayır həyat,
Sirrlər dünyasıdır qoca kainat.

Baxıram, fırlanır bu Yer kürəsi,
Gəlir qulağıma bir heyrət səsi.
Görürəm torpaqda bir nur parçası,
Bu parça – bir dünya behişt xonçası.
Suları dirilik suyuna bənzər,
Çəməni, çiçəyi, aləmi bəzər.
Yalçın qayaları uzanır göyə,
Gözəllik həkk olub burda hər şeyə.
Dağların qoynunda bu bir mahaldır,
Tarixi əbədi sirrli sualdır.
Nurlu sinəsində bir mavi göl var,
Oynaşır sularda qızıl balıqlar.
Doymuram çayların nəğmə səsindən,
Şirin bulaqların zümzüməsindən,
Günəş heyran-heyran qızdırır yeri,
Salama çağırır Ayi, Ülkəri.
Ilğıma bənzəyir qalın meşələr,
Başını dik tutur tər bənövşələr.
Yerlərə sığışmır bağı, bağatı,
Göyləri mat qoyub Cənnət baratı.
Baxıb, öz-özümə deyirəm: «Bəlkə,
Mahal söylədiyim bu kiçik ölkə,
Bütün Yer üzünün başlanğıcıdır,
Anamız dünyanın şöhrət tacıdır?!»

Sən eşit, gör hələ könlüm nə deyir,
Bəlkə də mələklər yurdudur bu yer.
O vaxt ki, nə insan, nə Yer varıymış,
Bəlkə də, bəlkə də Cənnət buraymış!

Bəzəyib hüsnünü güldən, çiçəkdən,
Behişt ətri gəlir hər bir ləçəkdən.
Bu yurdun qışı da xoş bir bahardır,
Tanrının sevgisi könlünə yardır.
Onu sevdirən də Tanrı özüdür.
Bu yurd mələklərin şirin sözüdür.
Göyçək ola-ola göyçəkləşibdir,
Göyçək deyildikcə göyçələşibdir.
Bir yanı çiçəkdir, bir yanı qöncə,
Adını Yaradan qoyubdur «Göyçə».

**2. Göyçə haqqında düşüncələr**

İndi xəyallarım çıraq-çıraqdır,
Sanki, yazılmamış bir ağ varaqdır.
Göyçə hey dolanır, dildə, ağızda,
Tərifə acizdir qələm-kağız da.
Adı mirvaridir, dürrdür, incidir,
Yaşından payı var, o, birincidir.
Göyçə – Yer üzündə bir nur parcası,
Onu yaratmayıb rəssam fırçası.
Onu yaradıbdır Qüdrətin əli,
Olubdur dünyanın ilkin gözəli,
Dünyamız yaranan zamandan bəri,
Göyçəmiz olubdur dillər əzbəri.
Göylərə sirdaşdır bu qədim diyar.
Burda haqq deyilən bir həqiqət var.
Tarixi, növrağı, eşqi uludur,

Getdiyi bir yol var, Haqqın yoludur.
Tanrının yanında ucadır adı,
Yerlərə hakimdir bəşər övladı.
Adına nə qədər qoşulub dastan.
Hər yan bir mənzərə, hər yan gülüstan.
Adamlar mehriban, istiqanlıdır,
Hər insan övladı adlı-sanlıdır.
Dillərdən düşməyir sözü, söhbəti,
Aləmə bəllidir gücü, qüdrəti.
Hünər misallıdır ərlər, ərənlər,
Baxıb, heyran olur bunu görənlər.
Baharda torpağı çiçək-çiçəkdir,
Burda asiman da gözəl-göyçəkdir.
Bal kimi şirindir buz bulaqları,
Aşıbdır başından dövləti, varı.
Marallar dolanır meşədə, dağda,
Sallanır torpağa meyvəsi bağda.
Sığışmır örüşə malı, qoyunu,
Burda görünməyir dünyanın sonu.
Həyadır, ismətdir gəlini, qızı,
Hər biri bir mələk, bir Dan Ulduzu.
Cəng olsa, heç zaman döyüşdən qaçmaz,
«Aslanın erkəyi, dişisi olmaz.»
Burda başqa dövran, başqa zamandır,
Hər oğul bir igid, bir qəhrəmandır.
Adı süfrəsində, çörəyindədir,
Qonağa hörməti ürəyindədir.
Haqqdan, halallıqdan alıb payını,

Tanrı yaratmayıb hələ tayını.
Qızıldan yüklənib daşı, torpağı,
Uzaq mahallardan gəlir sorağı.
Gölündə yaşayır dəniz ayğırı,
Burdadır dünyanın əzəl-axırı.
Gözəldir, göyçəkdir,  əzizdir, ancaq
Dahilər yurdudur bu ulu torpaq.
Zərdüşt bir zamanlar Göyçədən keçib,
Çörəyindən yeyib, suyundan içib.
Mat qalıb burdakı eşqə, hörmətə,
Bir də insanlığa olan qiymətə.
Alqışlar söyləyib burda varlığa,
Qəlbi fərəhindən dönüb bir dağa.
Gedərkən deyib ki, sağ-salamat qal,
Zamanın sirdaşı, ay göyçək mahal.
Sayı bilinməyib gəlib-gedənin.

Güzarı çox düşüb Qorqud Dədənin.
Göyçənin vəsfini çox sığallayıb,
Bu yurdu bir Cənnət, möcüzə sayıb.
Deyirlər, müqəddəs Həzrət Əli də,
Olub ziyarətdə bu doğma eldə.
O da bu torpaqda duz-çörək yeyib,
O da bu torpağa «nə göyçək» deyib.
Burda çox dincəlib, sultanlar, xanlar,
Sayılan padşahlar, bir də xaqanlar.
Olubdur bambaşqa hökmü zamanın,
Göyçə vətənidir Oğuz xaqanın.
Dünyanı fəth edib Oğuz elləri,

Bu adla tanınıb ər nəsilləri.
Bir oğul da var ki, bəllidir adı.

Allah özü sevib ulu Ustadı,
O, tanınmış dövlət, din xadimidir,
Filosof, sərkərdə, sufi şairdir.
Aşıq dünyasında bir hökmdardır,
Saz ilə, söz ilə bir yadigardır.
Müdrik bir insandır bu maarifpərvər,
Anadan olalı Ər doğulub, Ər.
Müəllim işləyib, məktəblər açıb,
Körpə beyinlərə elmdən nur saçıb.
Müqəddəs Ocağı ümid, pənahdır,
Ona müqəddəslik verən Allahdır.
Deyirlər, çatıbdır yüz beşə yaşı,
Olub doğru yolun, Haqqın yoldaşı.
Qızılbaş dövründə: beş yüz il qabaq,
Dövlət işlərində işləyib ancaq.
Xətai ata tək sevərmiş onu,
Hələ qurtarmayıb bu eşqin sonu.
Deməyin, – əfsanə, ya da xəyaldır,
Bu, böyük şəxsiyyət Miskin Abdaldır!

### 3. Poemanın yazılmasının səbəbi

Yenə çıraqbandır şahin xəyalım,
Uzaq əsrlərdən gəlir sualım.
O, kimdir Haqq ilə yaşayıb qoşa,
Ömrü Haqq yolunda çatdırıb başa.

Bu, çətin sualdan düşmürəm qəmə,
Cavabı bəllidir elə, aləmə.

Altı yüz ildir ki, yaşayır bir ad,
Ondan ibrət alır həm doğma, həm yad.
Anadan olalı Hüseyndir  adı,
«Miskin Abdal» – olub Haqqın baratı.
«Abdal» qeyrət rəmzi, bahadırlıqdır,
Haqqın dərgahında bəxtiyarlıqdır.
Zərgərli kəndində doğub bu günəş,
Bu günəş hər qəlbə salıb bir atəş.
Qəlbinə qoymayıb küdurət, kini,
Bu Haqqın aşiqi, Tanrı Miskini.
Bilib ki, bu dünya gəldi-gedərdi,
Namərd ayağına verməyib mərdi.
Ümid yeri olub ziyarətgahı,
Bunu qismət edib qadir Allahı.
Haqq ilə dünyanı gəzib, dolaşıb,
Haqqı sevə-sevə Övliyalaşıb.
Şah deyib: «Eşidin, mömin insanlar,
Abdal dünyasının gizli sirri var.
Sidq ilə inanın, mötəbər şəxsdir,
Hər mətləb diləyin, deməyin bəsdir.
Onun cəddi çatar köməyinizə,
Bir aydınlıq gələr ürəyinizə».
Dünən də, bu gün də əzizdir bu ad,
Qalıb xatirə tək, yaşamır, heyhat!

Bu, böyük ustadı gəl yaxşı tanı,
Hələ yazılmayıb ömür dastanı.
Bu, gizli deyildir, deyirəm aşkar,
Onu vəsf etməyə varmı sənətkar?!
Bu, hələ anılmaz bir həqiqətdir,
Sevilən – sənətkar, bir də sənətdir.

Şair olmasam da tapıb cürəti,
Qələmə aldım mən bu hekayəti.
Abdalın ömrünü incilər bəzər,
Gərək layiq olsun by kiçik əsər.
Qoy mənə güc versin Ulu Yaradan,
Əsərin adını qoyuram «Şadman».

## 4. Şadman kimdir?..

Bir Günəş nur saçır qatı zülmətə,
Belə başlayıram bu hekayətə.
Cavabsız qoyarsa kim bu sualı,
Gərək öyrənsin o, Miskin Abdalı.
O, Miskin Abdal ki, aləmdə təkdir,
Dünəndir, bu gündür, bir gələcəkdir.
Doğulub anadan ulu Göyçədə,
Ona heyran olub ulu Göyçə də.
Tayfası «Zərgərli», kəndi «Zərgərli»,
Yaşayıb ömrünü, aydın səhərli.
Aləmi-röyada cavanlıq vaxtı,
Qurulub Təbrizdə məhəbbət taxtı,

İlan Mahmudun tək Sənubər qızı,
O, qız söylədiyim, o, Dan Ulduzu.
Haqqdan aşiqinə verilib buta,
Bu yolda olsa da min cürə xata.
Haqqın ətəyindən tutub aşiqlər,
Arzu-murazına yetib aşiqlər.
Toydan ötüşməmiş hələ neçə ay,
Batır üfiqlərdə bədirlənmiş Ay.
Bu, ölüm sızladır bütün mahalı,
Bu, ölüm sarsıdır Miskin Abdalı.
Görür zəhrimarı bişmiş aşında,
O, bir də evlənir əlli yaşında.

Açılır ömründə yeni səhifə,
Məcburi evlənir ikinci dəfə.
Ağrıdağın yazda açan nərgizi,
İrəvan elindən bir tacir qızı.
Düşür qismətinə: bəlli aləmə,
Özü gül qoxulu, adı Həlimə.
Bir yerdə yaşayıb, ömür sürürlər,
Gözəl dövran qurub, xoş gün görürlər.
Dövləti başından aşıb-daşırmış,
Övlad sarıdan da qisməti varmış.
Olur dörd uşağı, yaxşıdır bilsən,
Şadman və Məleykə, Əli və Həsən.
Dağıstan dağları tufan qoparır,
Əlini, Həsəni birdən aparır.
Əzəldən qisməti beləymiş, bəlkə,
Yaşayıb ömr edir Şadman, Məleykə.

Məleykə qız deyil, o, bir mələkdir,
Namusda, ismətdə aləmdə təkdir.
Şadman miskinliyin şadimanıdır,
Bir elin basılmaz qəhrəmanıdır.

## 5. Şadmanın «Qoşabulaq» suyundan içməsi

Dünyanın çox olub gizli heyrəti,
Belə nəql edirlər bu hekayəti:
Deyirlər, Göyçədə «behişt» donunda,
Tərsə yaylağında, dağlar qoynunda,
«Ağ qaya» deyilən uca bir dağın,
Ətəyində axan «Qoşa bulağın»,
Suları dumduru, Aydan arıymış,
Hamıdan gizli bir sirri varıymış.
Aqillər deyib ki, yeddi ildən bir,
Bir gecə yarısı zühr olur bu sirr.
Deyir, sökülməmiş hələ dan yeri,
Məğribdən bir ulduz, məşriqdən biri,
Qalxıb göy üzünə, birdən toqqaşır,
Bu anda bulaqlar kükrəyib, daşır.
Köpüklü bir çaya dönür bulaqlar,
Az keçmir, çıraq tək sönür bulaqlar.
Bu an kim keçərsə köpüklü çaydan,
Doyunca içərsə köpüklü çaydan,
O kəsin birə yüz artar qüvvəti,
Düşmən qabağında basılmaz qəti.

Onun nərəsindən titrəyər dağlar,
Bir anlıq dayanar qaynar bulaqlar.
Kimin ki, qəlbində vardır xoş niyyət,
Bu, Tanrı vergisi onadır qismət.
Şadman da, atı da bu çaydan keçib,
Bulağın köpüklü suyundan içib,
Şadman, elə bil ki, döndü bir şirə,
Köhləni sığmadı nə göyə, yerə.
Yeni qüvvət verdi qadir Yaradan,
Sübh çağı qayıtdı evə oradan.
Başına gələni danışdı bir-bir,
Hamını heyrətə gətirdi bu sirr.
Şadmanın sorağı düşdü dillərə.
Çatdı yaxın-uzaq bütün ellərə.
Adına and içib əziz tutdular,
Qüssəni, məlalı tam unutdular.
Dedilər, yenilməz bir pəhləvandır,
Mayası pak olan təmiz insandır.

Şadman uşaq vaxtı sevsə də hərbi,
Edib sinədəftər farsı, ərəbi,
Az vaxtda eyləyib «Quran»ı əzbər,
Dünyada hər elmdən verib bir xəbər.
Böyüyüb, boy atıb sazın səsində,
Tanrını yad edib hər kəlməsində.
Böyüyün, kiçiyin bilib yolunu,
Hamı əzizləyib bu el oğlunu.
Ancaq qoçaqlıqda yoxuymuş tayı.
Haqqdan, igidlikdən varıymış payı.

Xam gəzən atlara kəmənd atarmış,
Qılınclar oynadıb, qalxan tutarmış.
Gəlsə də dağlardan dəli nərəsi,
Dilindən düşməzmiş «Yasin» surəsi.
Şahlığa layiqmiş boyu, buxunu,
Heyrətə salırmış bu hal çoxunu.
Cavanlıq çağından sevməzmiş cəngi,
Olsa, andırarmış qızğın pələngi.
Onunla hər cavan etməzmiş bəhsi,
Dəyərmiş hədəfə oxu, nizəsi.
Batmanlıq daşları atıb-tutarmış,
«Mənəm» deyənlərə qan uddurarmış.
Batmandan ağırmış misri qılıncı,
Dağlar – vüqarıymış, daşlar – balıncı.
Şadman qoruyurmuş vətən yurdunu,
Xilaskar bilirmiş mahal, yurd onu.
Olsa da çox cavan, varmış təmkini,
Qəlbində tutmazmış intiqam, kini.
Heç zaman əlindən çıxmazmış xata,
Tanrı aşiqiymiş oğul və ata.
Heç zaman, heç harda axıtmazmış qan,
Hər yerdə köməyi olmuş Yaradan.
Bir güc aldısa da «Qoşabulaq»dan,
Onun bu qisməti gəlmişdi Haqqdan.
Qədrini bilirmiş Göycək mahalın,
Çünki o, oğluydu Miskin Abdalın.
Burda qoruyurmuş bütün sərhəddi,
Oğulun qılıncı, atanın cəddi.

## 6. Maralların qeybdən sağına gəlməsi

Miskin Abdal gəzir dildə-ağızda,
Acizdir deməyə qələm-kağız da.
Heyrətli, ibrətli möcüzələri,
Tarixdə qoyubdur nəqqaş izləri.
Olub, yazılmamış bir qalın dastan,
Müqəddəs sayılan bu, məşhur insan.
Haqqın töhfəsiymiş ziyarətgahı,
«Ocağ»ı bəxş edib ona Allahı.
Əzəldən qisməti varıymış Haqqdan,
Ruzi tükənməzmiş qaynar «Ocaq»dan.
Allahdan nə varsa qismətmiş ona,
Göyçənin Övliya, Seyyid oğluna.
Ona səcdə etmiş dağın qarı da,
Çölün quşları da, heyvanları da.
Bu haqda yaşayır xeyli rəvayət,
Aqillər maraqla eyləyir söhbət:
Deyirlər, nə qədər sağ imiş Abdal,
Nələr möcüzələr görüb, el, mahal.
Dolanır bu yurdun söhbət, sazında,
Hər ilin payızı, bir də yazında.
Düzülüb muncuq tək, hey qatar-qatar,
Göyçənin üstündən uçan durnalar
«Miskin ocağı»ndan murad alarmış,
Hərəsi dümağ bir lələk salarmış.
Belə bir rəvayət var bizim eldə,
Daha çox söylənir ağızda, dildə:

Deyir, sökülməmiş hələ dan yeri,
Şadman yaylaqlardan dönəndə geri,
Görür həyətdə var bir xeyli maral,
Tamam ağzınacan dolmuşdur xal-xal.
Marallar gövşəyir, yatır, dincəlir,
Şadmanın ağlına gör nələr gəlir?
Deyir: «Bəlkə, atam bu gecə yarı,
Meşədən gətirib bu maralları?»
Bu vaxt içəridən qapı açılır,
Elə bil, dörd yana bir nur saçılır.
Gəlir Miskin Abdal, baxır Şadmana,
Təəccüblü gəlir gördüyü ona.
Soruşur: «Ay oğul, bu nə maraldır?»
Şadman dinə bilmir, elə bil, laldır.
Handan-hana deyir: «Bilməm, ay ata»,
Abdal görür, burda olmayıb xata.
Bu sirr agah olur, söyləyir Abdal:
«Qeybdən sağına gəlibdir maral».
Böyük məhəbbətlə baxır oğluna,
Əl açıb göylərin sonsuzluğuna,
Şükürlər oxuyur, dualar edir,
Bu sözlər varlığa saçır bir ətir.
Belə möcüzələr olubdur az-az,
Sonra da o qılır üç rükət namaz.
Bu xəbər bir gündə çatır hər yerə,
Hamı heyran qalır bu yeni sirrə.
O gündən sağına gəlir marallar,
Ancaq yaşayacaq hələ suallar...

## 7. «Buğa bölünən» adının yaranması

Zaman öz yolunda dolanıb, gedir,
Çalxanıb, durulub, bulanıb, gedir.
Şirin xatirələr dönür nağıla,
Yeni bir söyləmə gəlir ağıla.
Bunu nəql eləyib bir aqil siftə,
Zərgərli kəndində, cənub tərəfdə
Bir yer var, adıdır: «Buğabölünən»,
Bəzənib dörd yanı çiçəknən, gülnən.
Bu səmtə bir kimsə salsa yolunu,
Ətri məst eyləyir insan oğlunu.
Bu yerlər büsbütün çəmənzarıymış,
Könüllər oxşayan bir gülzarıymış.
Meşələr qoynuymuş yamaclar, yollar,
Abdal ocağına gedən marallar
Bir sirdaş olarmış aydın səhərə,
İlk dəfə enərmiş bu, tala yerə.
Burda da dünyanın bir sirri varmış,
Buğa bölünərək, burda qalarmış,
Sağına gedərmiş ana marallar,
Bu bir həqiqətdir, yox ehtimallar.
O vaxtdan şirindir bu sirrin dadı,
Bil, «Buğabölünən» qalıbdır adı.

## 8. Bir dəstə şahsevənin «Miskin Abdalın Ocağı»na oğurluğa gəlməsi

Abdal çox məhşurdur Şərqdə, Qafqazda,
Sözü söylənirdi Şamda, Şirazda.

Dillərdən düşmürdü «Miskin Ocağı»,
Yoxdu ehtiramın ucu-bucağı.
Onu tanıyırdı neçə ölkələr,
Onu izləyirdi qara kölgələr.
Dünyanın şeytanı ölməyib hələ,
Bunu söyləyənlər deyirdi belə:
Göyçə mahalına bir uzaq yerdən
Bir dəstə naxələf şahsevənlərdən,
Mayası yoğrulan şərab suyunda,
Şeytan əməllilər insan donunda,
Haqqın haqq payından düşüb uzağa,
Gəlirlər «Ocağı»ı oğurlamağa.
Qəlbi saf bir oğlan bir yaz səhəri,
Abdala çatdırır bu bəd xəbəri.
Deyir ki, gəlirlər cənub tərəfdən,
Bu vaxt Şadman çıxır bayıra evdən.
Eşidib bu sözü, qaralır rəngi,
Görkəmi andırır qızmış pələngi.
Hörmətlə baş əyib deyir: «Ay ata,
Qoymam ayaq açsın bu qəfil-qada,
Qəlbim apaydındır, məsləkim duru,
İzn ver qaytarım oğru, qulduru».
Abdal çox təmkinlə deyir astadan:
«İzndir, get, oğul, bircə tökmə qan».
Şadman süvar olur Qara Köhlənə,
Özündə rahatlıq tapmayır yenə.
Deyir: «Sayıq olun, baxın dörd yana,
Hələ «getmək olmaz» gələn oğlana,
Sınayaq,  dediyi doğrudur, düzdür,

Bəlkə aldadılmış bir fitnə, sözdür.
Necə qurtarırıq görək davanı,
Sonra buraxarıq həmin cavanı.
İnşallah, işimiz düşər yoluna,
Tanrı pənah olar Abdal oğluna».
Şadmana qoşulur bir neçə atlı,
Atlar at deyil ki, bir yel qanadlı.
Abdal ümidini üzmür Tanrıdan,
Yalvarır: «Şadmanı qoru, Yaradan!»
Oğullar deyilən səmtə yol alır,
Abdalın gözləri yollarda qalır.
Çeşdəkdə çatırlar uca bir dağa,
Atları bir az da sürüb qabağa,
Neçə binə keçib, bələn aşırlar,
Göyçə torpağından uzaqlaşırlar.
Burdan görünürdü "İsti su" dağı,
Dumana dönmüşdü qaynar bulağı.
Bir də baxırlar ki, düz on beş atlı,
İblis məsləklilər doğmalı, yadlı,
Dərənin dibindən qalxır yuxarı,
Gəlirlər lap üzü Göyçəyə sarı.
Şadmangil atları yançidar vurur,
Gizli bir tərəfdə pusquda durur.
Deyir: «Xeyir gəlməz, söyləməsək şər,
Deyiblər, tələsən təndirə düşər.
Kişi tək vuruşmaq sonuncu yoldur,
Görək, nə eyləyir bu oğru, quldur.
Yaxşısı, bu başdan bir dil taparıq,
Tapmasaq, qılıncla qırıb, çaparıq».

Oğrular çatırlar yaxın təpəyə,
Başçı oxşayırdı qıllı köpəyə.
Dayanıb, əmr edir o, birdən-birə:
«Burda dincəlirik, tökülün yerə!
Naharın vaxtıdır, yeyib-içərik,
Sonra bu dağları aşıb keçərik.
«Ocağ»ın yoxluğu çatar hər yerə,
Bir qaxınc qoyarıq Göyçəlilərə.
İndi hörükləyin yorğun atları,
Yesinlər çiçəkli, dadlı otları.
Siz də tonqal çatın, sulansın kabab,
Yorğun ruhumuza can versin şərab.
Bilmirəm, nə qədər qalıb yolumuz».
Bu, vəhşi qəlbləri bağlayıbdı buz.
Bu anda dil tökür bir kosa saqqal,
Bələdçi adlanan bu qoca çaqqal,
Baxıb Göyçə səmtə, göstərir yolu.
Bu, vicdan oğrusu, bu, şeytan qulu,
Deyir ki, «yolumuz qalıbdır lap az,
Axşama çatarıq, keflər olar saz.
Sabah gün doğmamış, burda sübh çağı,
Açılıb, tökülər «Miskin Ocagı».
Onda bilərsiniz sədaqətimi,
Ataman itirməz bu zəhmətimi,
Sevinər, şadlanar, uğurlu işdən,
Verər bəxşişimi qızıl, gümüşdən».

Çox basıb-bağlayır bir başqa dılğır,
Başçının üzündən zəhrimar yağır.

Mədhiyyə söyləyir o biri sarsaq,
Bundan nəşələnir başçı qurumsaq.
Bilmir ki, ikiqat günahdır bu iş,
Yeməyə, içməyə verir göstəriş.
Süfrəyə əmlikdən kabab düzülür,
İri tuluqlardan şərab süzülür.
Burda duru axmır, bulanıb sular,
Burda qan-qan deyir çaşqın arzular.
Kafirlər itirib Haqqın yolunu,
Kafirlər tanımır sağı-solunu.
Oğrular gör kimə meydan oxuyur?!
Onlar özlərinə bir tor toxuyur.
Axı, bu quldurlar bilsin haradan,
«Ocağ»ı qoruyur ulu Yaradan.

Getdikcə qızışır, yeyib, içirlər.
Meydan nəşələnib, həddi keçirlər.
Boşalır tuluğun meyi, şərabı,
Oğru-quldurların qalmayır tabı.
Gözlər nəşəlidir, ağıl dumanlı,
Mey edib hamını gözləri qanlı.
Dağları götürüb hay-haray səsi,
Burda tanımayır iti yiyəsi.
Gözlər hədəqədən çıxır az qala,
Günaha şahiddir indi bu tala.
Başlarda nə bir baş, nə də huş qalıb,
Yaradan onların ağlını alıb.
Aralıq qızışır, din, məzhəb itir,
Bu anda məclisin nəşəsi bitir.

Ataman qışqırır birdən ucadan:
«Gözüm su içməyir heç bu qocadan,
Bəlkə, o, aparır bizi tələyə?
Bəlkə, satılmışıq hiylə, kələyə?
Bəlkə, heç xəbəri  yoxdur Göyçədən?
Bizə xeyir gəlməz bu dilənçidən.
Bəlkə, içimizdə var satqınımız?
Birdən nahaq yerə axar qanımız!» –
Deməklə, əlini atır qılınca.

Hələ söz tapmamış bu məlun qoca,
Üzülür bədəndən o donqar başı.
Dəstə hiss eləyir qorxu, təlaşı.
Ataman qılıncı qoymur qınına,
Başqa bir quldurun girir qanına.
Bu anda aralıq yaman qarışır,
Oğrular yuxulu, oğrular çaşır.
Qılınclar işləyir, diksinir meşə,
Müsibət, qışqırır dirənir Ərşə.
Oğru, quldurların çaşqın hirsindən,
Kəsilən başların fəryad səsindən
Atlar hörükləri qırıb, gedirlər,
Göyçə səmtə doğru gözdən itirlər.
Kəsir yüz əyrini tək bircə doğru,
Meydanda qalıbdır bir neçə oğru.
Başçının başını çapıbdır biri,
Ancaq ölməmişdir, qalmışdır diri.
O biri oğrular tamam yaralı,
Fikirlər çaşqındır ağlı-qaralı.

Onlar Haqqa yenə düşübdür asi,
Yolundan azanın budur cəzası.
Meydanda fırlanır bu sərxoş dana.

Şadmangil pusqudan çıxır meydana.
Görüb ərənləri, oğrular çaşır,
Keçilməz dağları dörd ayaq aşır.
Burda tamamlanır qanlı mənzərə,
İbrət dərsi olur böhtana, şərə.

Şadman heyran qalır Haqqın səsinə,
Tanrının bu günkü möcüzəsinə.
Şükürlər oxuyub, dua edirlər,
Atlanıb, Göyçəyə tərəf gedirlər.
Deyirlər: «nə yaxşı biz tökmədik qan,
Namərdi haqqına qoydu Yaradan».
Göyçəyə çatırlar hələ gün varkən,
Tərsə yaylağına gəlirlər erkən.
Baxıb görürlər ki, elə həmin vaxt,
Yəhərli, yüyənli qaçan on beş at,
Namərd yiyəsini qoyaraq darda,
Abdal ilxısına qarışıb burda.
Bu xəbər yayılır neçə mahala,
Hamı qibtə edir Miskin Abdala.
Söylənən bu söhbət keçmiş həyatdır,
Abdal dünyasından bir xatiratdır.

## 9. Bir dəstə şahsevənin «Sarı yer» yaylağına oğurluğa gəlməsi və Şadmanın onlardan onunu öldürməsi.

Dağdakı faciə söylənir axır,
Bu, məlun qulduru yandırıb, yaxır.

Deyir: «Fələk daşa vurdu oxumu,
Göstərrəm Abdala kim olduğumu.
Bütün el içində edərəm rüsvay,
Bu heyfi mən onda qoymaram vay, vay!
Onun cəddi varsa, mənim gücüm var,
Qan ilə yuyulan bir qılıncım var!»
Xainlik, paxıllıq içini yeyir,
«Mən də bir Şahsevən oğluyam» – deyir.

Çapıq quldur qalır bir müddət xəstə,
Sonra o toplayır bir yeni dəstə.
Hamısı düzəlir şahsevənlərdən,
İblis çəpər çəkir özünə şərdən.
Yaraqlı, yasaqlı iyirmi nəfər,
Göyçə mahalına eyləyir səfər.
Aydındır, məlunun hissi, paxırı,
Hədəfdir Abdalın sürü, naxırı.
Elat ulu Göyçə dağlarındadır,
Bilirlər, «Sarı yer» yaylağındadır.
Naqisin içini alıbdır bir dərd,
Dinsiz, imansızdır bu çapıq namərd.
Tanımır Allahı, yolundan azıb,
Özü, öz əliylə qəbrini qazıb.
Haqqın düşmənidir fırıldaq, kələk,
Sən say saydığını, nə sayır fələk...
Alçaq niyyətindən əl çəkmir naşı,
Sanki, dayanmışdır Allaha qarşı.
Bu dəfə nəşədən tam vaz keçirlər,
Nə kabab yeyirlər, nə mey içirlər.
Deyirlər, bu qalsın qayıdan başa,

Bilmir, oxu çoxdan dəyibdir daşa.
Hələ soyumayıb əvvəlki hirsi,
Çıxmır yadındakı birinci dərsi.
Özü də bilmir ki, o, hara gedir,
Nə bilsin bu dəfə o, gora gedir.
Allahın qəzəbi tutmuşdur onu,
Çatıb bu quldurun ömrünün sonu.
Atadan, babadan belə məsəl var:
«Gün gələr, su qabı suda da sınar».
Bir də deyiblər ki, «Getsə də hara,
Bic, ölər, heç zaman tək getməz gora».

Gecələr yatmayır, olmasın xata,
Şadman keşik çəkir bütün elata.
Qoruyur tək özü bütün yaylağı,
Elata yadların dəymir ayağı.
Burda arxayındır çoban, naxırçı,
Heç nədən çəkinmir, yatır ilxıçı.
Bəzən də yamacda çalınır tütək,
İtlər də arabir hürüşür tək-tək.
Burdadır Abdalın Kəbkəb iti də.

Bir çoban oxuyur yanıq şikəstə.
Ay doğub süd kimi. Bir gecə yarı,
Göylərdən uçurdu durna qatarı.
Bu dəmdə hürüşür itlər ucadan,
Səhərə çox qalıb, sökülməyib dan.
Ucadan kişnəyir Qara Köhlən də,
«Bəlkə, oğru girib yaylaqda həndə».

Belə fikirləşib, atlanır Şadman,
Kəbkəb də zənciri qırır bu zaman.
Hürə-hürə cumur dağlara sarı,
Çöllər də diksinir bu gecə yarı.
Şadman əl gəzdirib qalxan, qılınca,
Sürür köhlənini itin dalınca.
Bu səs-küy səngimir, düzə yayılır,
Yatmış yuxusundan elat ayılır.
Hamısı atlanır səs gələn səmtə,
Şadman yetişir ki, böyük bir dəstə
İlxıya, sürüyə yaxınlaşırlar.
Quldurlar Şadmanı görüb çaşırlar.
Qabaqda durmuşdu o, çapıq quldur,
Şadman zəndlə baxıb deyir ki, «Odur!»
Şadman da quldura lap tanış gəlir,
Elə bil, üstünə boran, qış gəlir.
Bir qorxu, bir təlaş düşür canına,
Bilmir nə söyləsin puç vicdanına.
Baxıb yan-yörəyə bu məlun qoca,
İstəyir əlini atsın qılınca.
Şadman birdən çəkir bir dəli nərə,
Bu səsə hay verir hər dağ, hər dərə.
Çiynindən sürüşüb, düşür yapıncı,
Parlayır havada misri qılıncı.
Cüssəsi, qeyrəti bu qara nərin,
Yarır bağırını şahsevənlərin.
Birinci qılıncla göstərib zoru,
Bölür tən ikiyə çapıq quldurу.
Sonra oğrulara cumur şiri-nər,

Bu igid anadan Ər doğulub, Ər.
Batmanlıq qılıncı od-alov saçır,
Qırılan qırılır, qaçan da qaçır.
Arxadan səs gəlir yaman çata-çat.
Şadman boş dayanmır, gəlincə elat,
On dənə meyidi düzür yan-yana,
Bilmir ki, onu da qaçıb ha yana.

Görüb bu qeyrəti hamı mat qalır,
Kiçiyi, böyüyü bir heyrət alır.
Qatılır ilxıya yiyəsiz atlar.
Burda şahiddir ki, çiçəklər, otlar,
Şadmanın bu qanda yoxdur günahı,
Onu bağışlayır qadir Allahı.
Kəsilir bu yerdən namərd qoxusu,
Dağılıb gecənin şirin yuxusu.
İndi axarına qayıdıb həyat,
Əvvəlki ömrünü yaşayır  elat.

**10. Maral südünün ocaqda qan kəsməsi**

Bir qaynar bulaqdır «Miskin Ocağı».
Gün hələ doğmamış, hər səhər çağı
Marallar qatarla gəlir sağına,
Bu həyət bənzəyir Cənnət bağına.
Sonra da qayıdıb, çıxıb gedirlər,
Gələn səhərədək gözdən itirlər.
Evin xanımıdır Həlimə qadın,
Ömür yoldaşıdır ulu Ustadın.

Onu sığallayıb Qüdrətin əli,
Ənliksiz, kirşansız bu el gözəli,
Yunları darayır, əriyir cəhrə,
Evində çalxanır il boyu nəhrə.
Corab da toxuyur, xana da qurur,
Ərişə naxışlı ilmələr vurur.
Onu bezikdirmir çoxsaylı işi,
İşləmək, çalışmaq olub vərdişi.
Çox vaxt baş qarışır, çörək də yemir,
Bir dəfə olsun da, yoruldum, – demir.
Bu eşqi veribdir ulu Tanrısı,
Kəsilmir bu evin qonaq-qarası.

Bir səhər, yenə də Həlimə durub,
Əvvəlcə təndirə bir çatqı qurub,
Qalayıb, od vurur quru təzəyə.
Bir az əl gəzdirir evdə bəzəyə.
Təndirin yanına yığır odunu,
Evdəki inəyin verir otunu.
Dən tökür toyuğa, yal verir itə.
Sonra sərnic alıb çıxır həyətə,
Sevir maralların maral boyunu,
Həsrətlə gözləyir marallar onu.
Zümzümə eyləyib lap ağır-ağır,
Ana maralları o, bir-bir sağır.
Dolu sərnicləri tökür qazana,
Şükürlər oxuyur yazı yazana.
Dualar söyləyir ruzi verənə,
Sevgisi birə yüz artır ərinə.

Qazanı ocağın üstünə qoyur,
Sərnici, badyanı, çömçəni yuyur.
Qablar öz yerinə düzülür çin-çin.

Sağıra, fağıra paylamaq üçün,
Bu gün tutmalıdır maral pendiri.
Daha gur qalayır sönən təndiri.
Bu evdə hey gəlir var üstə vara,
Bu Ocaq, çörəkdir ac qarınlara.
Həlimə o işə, bu işə qacır.
Vaxt olur, qazanın ağzını acır,
İnanmır gözünə;  süd qan kəsibdir!
«İlahi, bu necə qismət, nəsibdir?!»
Onun həyəcandan artır təşvişi,
Ucadan səsləyib, deyir: «Ay kişi!
Gəl, gör başımıza gələn bu nədi?
Qan kəsib ocaqda maralın südü».

Gəlir Miskin Abdal – başı bəlalı,
Üşənir bədəni, dəyişir halı.
Baxıb, gördüyünə inanmır özü,
Bilmir ki, haradan başlasın sözü.
Fırlanır başına bu həyət, bu dam,
«Yəqin, oğlum Şadman öldürüb adam!» –
Deyib, köks ötürür, əyilir qəddi,
Olur təsəllisi sınaqlı cəddi.
Eşidib buraya toplaşır hamı,
Həyət bənzədir bir gur izdihamı.
Bura yığışanlar kədərdə, qəmdə.
Şadman evə girir, elə bu dəmdə.
Olub keçənləri danışır bir-bir,

Abdalda qalmayır nə hal, nə səbir.
Bunu eşidəndə yanıb, yaxılır,
Nə yeriyə bilir, nə də yıxılır.
Hirsindən, elə bil, yanır dünyası,
Burum-burum olur əldə əsası.
Qeyz ilə çəliyi torpağa vurur,
Bu vaxt bir zəlzələ, tufan baş verir.
Sonra da Şadmana qarğış tökür o,
Ocaqdan bir höyüş odun çəkir o.
Tanrı qəzəbiylə atır oğluna,
Çünki, bir xəsarət yetirsin ona.

Abdal qəzəblidir, coşur yenidən,
Ata qəzəbindən, ata kinindən,
Şadmanı qoruyur qadir Allahı,
Bilir ki, bu işdə yoxdur günahı.
Göstərir bir yeni möcüzəsini,
Kəsir O, Miskinin qarğış səsini.
Ağac Şadmana yox, araya çatır,
Torpağa sancılıb, qol-budaq atır,
Olur bir qaramtul armud ağacı,
Həqiqət şirindir, olsa da acı.
Bunu görənləri götürür heyrət,
Şadmana çoxalır sevgi, məhəbbət.
Abdal tutduğundan olur peşiman,
Onun gözlərində gülür asiman.
Verir qarğışını əyri-oğrunun,
Bilir, pənahıdır Tanrı oğlunun,
Sonra da o, qılır üç rükət namaz.
Olur bu deyilən tarixdə az-az.

Deyir, dağdan qaçan on oğru-əyri,
Vəbadan ölürlər, qalmayır biri.

**11. Miskin Abdalın, oğlu Şadmana vəsiyyət etməsi**

Nə ölüm, nə zülüm görmədi dünya,
Sirrini heç kimə vermədi dünya.
Torpaqdan yaranan torpağa döndü,
Hər şey əfsanəyə, nağıla döndü.
Hər ömrün əzəli, bir sonu vardır,
Əzəli toy-bayram, sonu məzardır.

Çatıbdır yüz beşə ustadın yaşı,
Haqqın dünyasına titrəyir başı.
Ölüm hər yerini gəzib mahalın,
Döyür qapısını Miskin Abdalın.
Qoyur köynəyinə sazını Abdal,
Çağırır oğlunu, qızını Abdal,
Deyir: «Balalarım, çatıbdır vaxtım,
Qurtarıb yollarım, uçubdur taxtım.
Bir şirin nağıldır insan həyatı,
Qoy dildə söylənsin bu, bir bayatı.

Ağ sular axar gedər,
Dağları yıxar gedər,
Dünya bir pəncərədir,
Hər gələn baxar gedər.

Oğluma, qızıma nəsihətim var,
Atadan yadigar vəsiyyətim var.
Qaralar geyinib çəkməyin dərdi,
Bu dünya həmişə gəldi-gedərdi.
Çalışın, saxlayın Haqqın yolunu,
Heç vaxt darda qoymaz Tanrı qulunu.
Şadman ağlamasın, kişi ağlamaz,
Məleykə şax durar, qara bağlamaz.
Qalmayıb ömrümün halı, dözümü,
Oğul, yaxına gəl, dinlə sözümü.
Günahın olsa da, olmasa da sən,
Ya haqqmı, nahaqqmı, qanlar tökübsən.
Günahdır «Ocağ»ım qalarsa sənə,
İndi çox diqqətlə qulaq as mənə.
Binim, bərəkətim, odum, ocağım,
Bu varım, bu mülküm, əkinim, bağım,
Oğul, sənin olsun. Ancaq pay deyə,
«Miskin Ocağı»nı ver Məleykəyə.
Mənim əziz qızım qoy qalmasın ac,
Bir tikə çörəyə olmasın möhtac.»

Kədərli baxışlar çəkilmir ondan,
Oğlunun, qızının öpür alnından.
Sonra mənalarla baxır Şadmana,
Od düşür könlünün xanimanına.
Söyləyir: «Nəyin var qələm, kağızdan?!.
Bu şerim düşməsin dildən, ağızdan!

Eşit deyim, dünya səndə,
Ayım, ilim, yazım qaldı.
Qövr eləyir söz sinəmdə,
Dil-dil ötən sazım qaldı.

Yar sevmişdim, yarım getdi,
Var yığmışdım, varım getdi.
Eşqim, etibarım getdi,
Ahım, ünüm, sızım qaldı.

Qayaları sökdürərdim,
Zərdən saray tikdirərdim,
Yağıları çökdürərdim,
Məndən təpər, dözüm qaldı.

Ərşə-gürşə bəlli əslim,
Yaradana ollam təslim,
Adnan-sannan olan nəslim,
Bir oğlum, bir qızım qaldı.

Hər nə varsa hədər imiş,
Hər şey gəldi-gedər imiş.
Ölüm yaman betər imiş,
Yol, ərkanım, izim qaldı.

Şadman könlüm tari-mardır,
Şanda balım zəhri-mardır,
Günüm-gecəm ahu-zardır,
Şirin-şirin sözüm qaldı.

Yaşayan kim, ölən kimdi,
Ağlayan kim, gülən kimdi,
Gedən gedir, gələn kimdi,
Nə mizrabım, nə sim qaldı.

Yoxdur daha Şahənşahım,
Ərşə bülənd oldu ahım.
Adım, sanım, qibləgahım,
Haqq çağıran səsim qaldı.

Telli saza mizrab vurdum,
Məclislərdə dastan qurdum,
Neçə-neçə aşıq yordum,
Sözüm düzüm-düzüm qaldı.

Bir şəcərəm, bir kəşkülüm,
Gur ocağım, odum, külüm,
Yığın-yığın varım, mülküm,
Al-qumaşım, bezim qaldı.

Dünya puçdu, puçdu dünya,
Dünya heçdi, heçdi dünya,
Abdal, yaman keçdi dünya,
Yaşamaqda gözüm qaldı.

Yaz, oğul, Haqqa da deyim sözümü,
Sonra bu varlığa yumum gözümü:

Bu dünya, o dünya var.
Allah, ölümün haqqdı!
Bir dirilik suyu var,
Allah, ölümün haqqdı!

Axırın puçdu, dünya.
Var ikən heçdi dünya.
Hey gəldi, keçdi dünya,
Allah, ölümün haqqdı!

Abdal, yastıq daş olar,
Üst torpağın yaş olar,
Mələklər yoldaş olar,
Allah ölümün haqqdı!»

Burda tamamlanır ömrünün sonu,
Alır qucağına mələklər onu.
Abdal vida deyir şerə, sənətə,
Yumur gözlərini əbədiyyətə.

**12. Şadmanın atasının vəsiyyətinə əməl etməsi.**

Kənddən qəbristana uzun yol gedir,
Abdalı hörmətlə eli dəfn edir.
Ağlayır çəməndə çiçəklər, otlar,
Dad çəkib üzülür göydə buludlar,
Hardasa göylərdə ildırım çaxır,
Üfüqə sürətlə bir ulduz axır.
Elə bil, əyilir uca dağlar da,
Elə bil, üşüyür buz bulaqlar da.
Elə bil, quşlar da deyir bayatı,
Bu qəm, elə bil ki, sökür həyatı.
Kədər içindədir oba, yurd, elat,
Düşmür ağızlardan bu müqəddəs ad.

Kəsilir qapıdan maral ayağı,
Durna lələyinin görünmür ağı.

Vaxt keçir, Şadmanın açılır başı,
Baxıb Məleykəyə deyir qardaşı:
«Ay bacı, çox çəkmə dərdi, xiffəti,
Atamız eyləyib bu vəsiyyəti.
Al, apar «Ocağı», sən də ol rahat,
Seyyid atamızın ruhu olsun şad».
Məleykə başıydı hər bir gözəlin,
Ata tayfasına köçmüşdü gəlin.
Gözü tox, könlü tox bu huri-mələk,
Həyadan vurmuşdu ömrünə bəzək.
Ehtiram eyləyib o, dönə-dönə,
«Ocağı» apardı əri evinə.

Sabah gözlərinə inanmadı o,
Başdakı taxçaya baxıb, yandı o.
Boş idi qoyduğu «Ocağ»ın yeri,
«Ocaq» qeyb olaraq getmişdi geri.
Şadman qaytarsa da «Ocağı» dərhal,
Hər gün təkrar oldu bu sehirli hal.
Yazıq qız mat qalır, dözmür bu işə,
Göz yaşı sel kimi axır həmişə.
Onun gözlərində hey dolaşır yaş,
Söyləyir: «Günahım nədir, ay qardaş?
Atamın «Ocağ»ı qeyb olur bizdən?!
Baş alıb çıxımmı mən evimizdən?!»
Qardaşı söyləyir: «Səbr et, döz bir az,

Yəqin ki, bu iş də səbəbsiz olmaz.
Darıxma, qəlbini eyləmə parə,
Yaradan buna da eyləyər çarə».
Göstərib əliylə köhnə bucağı,
Qaytarır yenə də qıza «Ocağı».
O gecə Şadmanı кədər götürür,
Yatıb bu niyyətlə bir yuxu görür.
Görür ki, atası deyir Şadmana:
«Oğul, lap dərindən qulaq as mana,
Heç vaxt saxlamayın mənim yasımı,
Harmaya taxdığım «burum» əsamı
Gətir qoy «Ocağa», geri qayıtmaz».
Ayılıb yuxudan, gözləyib bir az,
Şadman həyacanla açıb səhəri,
Görür «Ocaq» yenə qayıdıb geri.
Tapır ürəyində bir dinclik Şadman,
Bir az ötüşmür ki, elə bu zaman,
Görünür qapıda bir tanış kölgə,
Yenə gözü yaşlı gəlir Məleykə.
Qardaşı söyləyir: «Ağlama daha,
Göz yaşı axıdıb, batma günaha.
Bu gecə yuxumda eylədim aşkar,
Nə mən günahkaram, nə sən günahkar.
Qəribə görünən bu iş baş qatır,
Bu qaranlıq sehrin sirri başqadır».
Söyləyib yuxuda gördüklərini,
Açır bu müqəddəs sehrin sirrini.
Çəliyi harmadan «Ocağ»a qoyur,
Deyir şad ürəklə: «Al, bacım, buyur,

Al, apar «Ocağ»ı, qəlbin olsun şad,
Sənindir bu qismət, sənindir bu ad.
Heç qalma nigaran, bunu yaxşı bil,
«Ocaq» səninkidir, qayıdan deyil.»

O gündən geriyə «Ocaq» dönmədi,
«Ocaq» qız evində qaldı əbədi.
O vaxtdan kəndində göyçək mahalın,
Müqəddəs adıyla Miskin Abdalın,
İki tayfa oldu bir Seyyidə qul;
«Ocaqlı» – qız nəsli, «Şadmanlı» – oğul.

## 13. E p i l o q

Mənalı günlərim getmədi hədər,
Axır, tamamlandı bu kiçik əsər.
Yazdım misra-misra, sətirbəsətir,
Dedim, hər kəlməmdən gəlsin bir ətir.
Çünki, burda Miskin Abdal adı var,
Müqəddəs ömrünün şirin dadı var.
Eşq olsun ustada, o, böyük ada!
Ondan iki nəsil qaldı dünyada.
Birinin başında dayandı Şadman,
Şadman ad ucaltdı, oldu pəhləvan.
Daim abad etdi ata yurdunu,
Bir dünya günahdır deməsək bunu.

Mən də bu sevgimlə üz tutdum şerə,
Dedim, qoy yayılsın səsim hər yerə.

Kim şeri sevdisə, sevdi həyatı,
Gəzdi nəğmələrdə, dillərdə adı.
Yaşasın şeriyyət, yaşasın sənət!
Şerlə bəzənsin, qoy bəşəriyyət!
Bu kiçik əsərim qəlbə yar olsun,
Abdal dünyasından yadigar olsun.

***Başlandı: 05 mart 2001-ci il***

***Qurtardı: 19 mart 2001-ci il***

# QEYDLƏR VƏ İZAHLAR

## Gəraylılar

***1. Dünya, səndə nəyim ɛaldı***

Şeiri Zeynalabdin Cəfərov 1980-ci illərin əvvəllərində 100 yaşında dünyasını dəyişən dayısı İsmayılov Kərəm Oruc oğlundan yazıya almışdır. (Hər ikisi Göyçə mahalının Kərkibaş kəndindəndirlər). Şeir ilk dəfə ’’Azad Azərbaycan” qəzetində (09 may 2001-ci il) çap olunmuşdur.

***2. Qocalıram***

Şeir Göyçənin Ağbulaq kəndindən olan 80 yaşlı aşıq Əli Babayevdən yazıya alınmışdır. İlk dəfə ’’Miskin Abdal” kitabında (Bakı 2001) çap olunmuşdur.

***3. Nədi***

Şeir Göyçəli Aşıq Hacı Bayramovdın yazıya alınmışdır. İlk dəfə ’’Miskin Abdal” kitabında (Bakı 2001) çap olunmuşdur.

***4. Dönər***

Əslən Göyçə mahalından olan 80 yaşlı tarix müəllimi Əziz Əhmədov bu şeirin, Şəmkirli Süleyman Sadiq oğlunun Tovuz rayonundan Xınnalı aşıq İdrisin dilindən qələmə alındığını bil-

dirir. Şeir ilk dəfə ’’Maarifçi” qəzetində (24 mart 1999-cu il) çap olunmuşdur.

***5. Basın***

Məmməd Aslan tərəfindən ’’Ədəbiyyat və incəsənət” qəzetində (30.11.1974) çap olunmuş bu şeir Qərbi Azərbaycanın Hamamlı (Spitak) rayonunun Qursalı kəndindən olan 78 yaşlı aşıq Bayram İsmayıl oğlu Mustafayevdən yazıya alınmışdır. O, bu şeiri Dərəçiçək mahalının Qaraqala kəndində olan məşhur saz-söz ustası aşıq Alıdan öyrəndiyini söyləyir.

***6. Düsərsən***

1981-ci ildə aşıq Əli Babayevdən yazıya alınmış bu şeir ilk dəfə ’’Kommunist” qəzetində (18.04.1991) çap edilmişdir.

***7. Fələk***

Zeynalabdin Cəfərovun dayısı Kərəm Oruc oğlundan yazıya aldığı bu şeir ilk dəfə ’’Palitra” qəzetində (23.01.2001) çap edilmişdir.

***8. Allah, ölümün haqdır***

Folklorçu Zeynalabdin Cəfərovun dayısı Kərəm Oruc oğlundan yazıya aldığı bu şeir ilk dəfə ’’Palitra” qəzetində (23.01.2001) çap edilmişdir.

***9. Gedin, deyin Lələ bəyə***

Şeir Göyçənin Cil kəndindən olan aşıq Müseyib Nəsibov-

dan yazıya alınmış və ilk dəfə ’’Miskin Abdal” (Bakı 2001) kitabında çap olunmuşdur.

***10. <u>Yarım</u>***

Şeir Göyçənin Ağbulaq kəndindən olan aşıq Sultanəli Abbasəliyevdən yazıya alınmış və ilk dəfə ’’Miskin Abdal” (Bakı 2001) kitabında çap olunmuşdur.

***11. <u>Bu da məni</u>***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ’’Miskin Abdal” (Bakı 2001) kitabında çap olunmuşdur.

***12. <u>Xos gəldin</u>***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ’’Miskin Abdal” (Bakı 2001) kitabında çap olunmuşdur.

***13. <u>Ağrı dağı</u>***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ’’Miskin Abdal” (Bakı 2001) kitabında çap olunmuşdur.

***14. İsmayıla***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə “Miskin Abdal” (Bakı 2001)

kitabında çap olunmuşdur.

***15. Tapınmışam***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ’’Maarifçi” qəzetində (24 mart 1999-cü il) çap olunmuşdur.

***16. Var (mədhiyyə)***

Şeiri Göyçəli Zeynalabdin Cəfərov dayısı Kərəm Oruc oğlundan yazıya almış və ilk dəfə ’’Ekspress” qəzetində (06 iyun 2003-cü il) çap olunmuşdur.

***17. İmam Rza (mərsiyyə)***

Şeiri Göyçəli Zeynalabdin Cəfərov dayısı Kərəm Oruc oğlundan yazıya almış və ilk dəfə ’’Ekspress” qəzetində (06 iyun 2003-cü il) çap olunmuşdur.

# QOŞMALAR

***1. <u>Ya Əli</u>***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ’’Miskin Abdal” (Bakı 2001) kitabında çap olunmuşdur.

***2. <u>Unutma</u>***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə 1998-ci ildə ’’Bahar-37” kitabında çap olunmuşdur.

***3. <u>Dağlar</u>***

Şeir ilk dəfə ’’Ədəbiyyat və incəsənət” qəzetində (30.11,1074-cü il) çap edilmişdir. Kim tərəfindən söyləndiyi və yazıya alındığı barədə məlumat yoxdur.

***4. <u>A dağlar.</u>***

Şeir ilk dəfə ’’Kommunist” qəzetində ”18.04.1991-ci il) çap edilmişdir. Kim tərəfindən yazıya alındığı barədə məlumat yoxdur.

***5. <u>Dağların</u>***

Şeirin bu variantı Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ’’Miskin Abdal» (Bakı 2001) kitabında çap olunmuşdur. Şeirin başqa bir vari-

antını 1998-ci ildə Dəmir Gədəbəyli «Azərbaycan" jurnalında (№9 səh.164.) çap etdirilmişdir.

***6. <u>A yaz avları</u>***

Kimdən toplanması məlum olmayan bu şeir ilk dəfə «Ulduz" jurnalında (1985, №7) çap olunmuşdur. Başqa bir variantda şeirin 1-ci bəndi belədir:

**«Başladı novbahar, çəmən seyrinə,**
**Çıxıbdı gözəllər, a yaz ayları,**
**Ətrin qarışıbdı çəmən ətrinə,**
**Dolanıb gəzərlər, a yaz ayları».**

"Miskin Abdal" kitabında (Bakı 2001) bu bənd getmişdir.

***7. <u>Yar deyə-deyə</u>***

Şeiri Göyçəli Zeynalabdin Cəfərov dayısı Kərəm Oruc oğlundan yazıya almış və ilk dəfə "Azad Azərbaycan" qəzetində (09.05.2001-ci il) çap olunmuşdur.

***8. <u>Gedər.</u>***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə 1998-ci ildə "Bahar-37" kitabında çap olunmuşdur.

***9. <u>Məni</u>***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ''Ağrı dağı" qəzetində

(1998, №15) çap olunmuşdur.

***10. <u>Qaldı</u>***

Göyçənin Sarıyaqub kənd sakini Əli Behbud oğlu tərəfindən yazıya alınmış bu şeir ilk dəfə ’’Şəmkir” qəzetində (1990) çap olunmuşdur.

***11. <u>Pir idi</u>***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ”El düzümləri, elat söyləmələri” kitabında (Bakı, Azərnəşr, 1993) və sonra ’’Ağrı dağı” qəzetində (1998, №11) çap olunmuşdur.

***12. <u>Ağlaram</u>***

Folklorçu professor Sədnik Paşayev tərəfindən yazıya alınmış bu şeir ilk dəfə şair Məmməd Aslan tərəfindən ’’Ədəbiyyat və incəsənət” qəzetində (30.11,1974-cü il) çap edilmişdir. Tarixi romanlar müəllifi, yazıçı Əzizə Cəfərzadə ’’Bakı -1501” əsərində bu şeirdən istifadə etmişdir.

***13. <u>Əlif-Lam</u>***

Folklorçu professor Sədnik Paşayevdən əldə olunmuş bu şeir ilk dəfə şair Məmməd Aslan tərəfindən ’’Ədəbiyyat və incəsənət” qəzetində (30.11.1974-cü il) çap edilmişdir. Şeirin kim tərəfindən söyləndiyi məlum deyildir.

***14. Qocalıq***

Şəmkirli Süleyman Sadiq oğlunun Tovuz rayonundan Xınnalı Aşıq İdrisin dilindən qələmə aldığı bu şeiri tarix müəllimi Əziz Əhmədov çatdırmışdır. İlk dəfə ''Ədəbiyyat" qəzetində (18.12.1998-ci il) çap edilmişdir.

***15. Dönərmi***

Şəmkirli Süleyman Sadiq oğlunun Tovuz rayonundan Xınnalı Aşıq İdrisin dilindən qələmə aldığı bu şeiri tarix müəllimi Əziz Əhmədov çatdırmışdır. İlk dəfə ''Ədəbiyyat" qəzetində (18.12.1998-ci il) çap edilmişdir.

***16. Dolanar***

Şəmkirli Süleyman Sadiq oğlunun Tovuz rayonundan Xınnalı Aşıq İdrisin dilindən qələmə aldığı bu şeiri tarix müəllimi Əziz Əhmədov çatdırmışdır. İlk dəfə ''Ədəbiyyat" qəzetində (18.12.1998-ci il) çap edilmişdir.

***17. Qocaldım***

Şəmkirli Süleyman Sadiq oğlunun Tovuz rayonundan Xınnalı Aşıq İdrisin dilindən qələmə aldığı bu şeiri tarix müəllimi Əziz Əhmədov çatdırmışdır. İlk dəfə ''Ədəbiyyat" qəzetində (18.12.1998-ci il) çap edilmişdir.

***18. Nökərəm***

Göyçə mahalının Babacan kəndindən olan aşıq Qədir Vəliyevdən Əziz Əhmədovun yazıya aldığı bu şeir ilk dəfə «Azər-

baycan müəllimi" qəzetində (06.05.1999-cü il) çap edilmişdir.

***19. Ağlaram***

Göyçənin Cil kəndindən olan Abbas Mazanovdan yazıya alınmış bu şeir ilk dəfə «Miskin Abdal" (Bakı 2001) kitabında çap olunmuşdur.

***20. Ayaq üstədi***

Göyçənin Cil kəndindən olan Abbas Mazanovdan yazıya alınmış bu şeir ilk dəfə «Göyçə kimi intizarda elim var" (Bakı 1999) kitabında çap olunmuşdur.

Göyçəli aşıq Hacı Bayramov bu şeirin başqa variantını söyləmişdir:

Səhərdən bu bağın keştinə vardım,
Bağbanı yatmayıb, ayaq üstədir,
Könlüm pərvaz eylər şahı görməyə,
Seyraqub yatmayıb, ayaq üstədir.

Qoca təbiəti qurur Mikayıl,
Məğribdən məşriqə gəzir Əzrail,
Tanrıdan sədalar verir Cəbrail,
Şeytan da yatmayıb, ayaq üstədir.

Abdalın paklığı düzgün cavabdır,
Doğru söz söyləmək özü savabdır,
Şahim, nə yatıbsan, dünya xarabdır,
Haqq özü yatmayıb, ayaq üstədir.

***(ilk dəfə ”Miskin Abdal” (Bakı 2001) kitabında çap olunmuşdur)***

Bu şeirin daha bir variantı isə tanınmış folklorçu, professor Sədnik Paşayevə və folklorçu Zeynalabdin Cəfərova görə belədir:

Səhərdən bu bağın keştinə vardım,
Bu bağın bağbanı ayaq üstədir.
Könlüm pərvaz eylər yarı görməyə,
Seyraqub yatmayıb, ayaq üstədir.

Seyraqublar yar köksündən atdılar,
Ağ üzünə yaşıl bürqə tutdular,
Peyğəmbər yanına nişan getdilər,
Gətirib Cəbrayıl, ayaq üstədir.

Haqqa salam verdim, hələf eylədi,
Ya Rəbb, Tur dağında Musa neylədi?
”Qırxlar” məclisində qulluq eylədi,
Pirim Şahi-Mərdan ayaq üstədir.

Haqqa salam verdim, aldı salamı,
Ya Rəbb, bu gözəllik səndə qalamı?
Yazılıb alına Haqqın kəlamı,
O, qələm tutanlar ayaq üstədir.

Miskin Hüseyn deyər ismim ərəbdir,
Eşqin piyaləsi dolu şərabdır,
Şahım, nə yatıbsan, dünya xarabdır,
Haqq özü yatmayıb, ayaq üstədir.

***(ilk dəfədir ki, bütövlükdə çap olunur.)***

***21. <u>Olmaz</u>***

Şeiri Abbas Mazanov atası Əli Mazan oğlundan yazıya almışdır və ilk dəfə ’’Miskin Abdal” (Bakı 2001) kitabında çap olunmuşdur. Şeirin Çaldıran döyüşü ilə bağlı deyildiyi daha çox ehtimal edilir.

***22. <u>Yetiş dadıma</u>***

Şeiri Göyçəli Zeynalabdin Cəfərov dayısı Kərəm Oruc oğlundan yazıya almış və ilk dəfə ’’Paritet” qəzetində (18.12.1998-ci il) çap olunmuşdur.

***23. <u>Biri nə?</u>***

Şeir professor Sədnik Paşayev tərəfindən toplanmışdır, ilk dəfədir, bütövlükdə çap olunur.

***24. <u>Ağrı dağı</u>***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ’’Miskin Abdal” (Bakı 2001) kitabında çap olunmuşdur.

***25. İsmayıl***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ’’Miskin Abdal” (Bakı 2001) kitabında çap olunmuşdur.

***26. Ya bir Allah, va Məhəmməd, va Əli!***

Şeiri Göyçəli Zeynalabdin Cəfərov dayısı Kərəm Oruc oğlundan yazıya almış və ilk dəfə ’’Ekspress” qəzetində (06.06.2003-cü il) çap olunmuşdur.

***27. Şah dağlar***

Şeiri Göyçəli Zeynalabdin Cəfərov dayısı Kərəm Oruc oğlundan yazıya almış və ilk dəfə ’’Palitra” qəzetində (24.07.2001-ci il) çap olunmuşdur.

***28. Getdi***

Şeir professor Sədnik Paşayev tərəfindən toplanmışdır, ilk dəfədir, bütövlükdə çap olunur.

***29. Verəsən***

Şeir professor Sədnik Paşayev tərəfindən toplanmışdır, ilk dəfədir, bütövlükdə çap olunur.

***30. Yaşıldır, yasıl***

Şeir professor Sədnik Paşayev tərəfindən toplanmışdır, ilk dəfədir, bütövlükdə çap olunur.

***31. Tap***

Şeir professor Sədnik Paşayev tərəfindən toplanmışdır, ilk dəfədir, bütövlükdə çap olunur.

***32. Gen gəz***

Şeir professor Sədnik Paşayev tərəfindən toplanmışdır, ilk dəfədir, bütövlükdə çap olunur.

# TƏCNİSLƏR

***1. El Ata***

Şəmkirli Süleyman Sadiq oğlunun Xınnalı Aşıq İdrisin dilindən qələmə aldığı bu şeir tarix müəllimi Əziz Əhmədovun imzası ilə ilk dəfə ’’Ədəbiyyat” qəzetində (18.12.1998-ci il) çap edilmişdir.

***2. Məni***

Bu təcnis ilk dəfə şair Məmməd Aslan tərəfindən ’’Ədəbiyyat və incəsənət” qəzetində (30.11,1974-cü il) çap edilmişdir.

# DEYİŞMƏLƏR

Hələlik yeganə olan bu deyişməni Zeynalabdin Cəfərov dayısı Kərəm İsmayılovun dilindən yazıya almış və ilk dəfə ’’Kaspi” qəzetində (14.12.2000) çap edilmişdir.

# BAYATILAR

Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış bayatılar ilk dəfə ’’Miskin Abdal” (Bakı 2001) kitabında çap olunmuşdur.

# DİVANİLƏR

***1. Ya Əli***

Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə «Miskin Abdal” (Bakı 2001) kitabında çap olunmuşdur.

***2. Qoymaram***

Göyçənin Ardanış kəndindən olan aşıq Kərim Paşayevdən yazıya alınmış və ilk dəfə «Azərbaycan müəllimi” qəzetində (06-12.05.1999-cü ildə) çap olunmuşdur.

***3. Məni***

Kimdən toplanması məlum olmayan bu şeir «Ədəbiyyat və incəsənət” qəzetində (30.11,1974-cü ildə) çap olunmuşdur.

***4. Yol vermədim***

Kimdən toplanması məlum olmayan bu şeir «Ədəbiyyat və incəsənət” qəzetində (30.11,1974-cü ildə) çap olunmuşdur.

***5. Narın üzə bilmərəm***

Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış bu şeir ilk dəfə «Ağrı dağı” qəzetində (1998.№11) çap olunmuşdur.

***6. <u>Zay olmusan</u>***

Bu şeir Zeynalabdin Cəfərov tərəfindən dayısı Kərəm Oruc oğlu İsmayılovdan yazıya almmış və ilk dəfə «Ağrı dağı” qəzetində (1998.№11) çap olunmuşdur.

***7. <u>Yarımçıq divani</u>***

**“Qoymaynan Miskin Abdal qəzada həlak olacaq,**
**Ey könül, gəl düş havadan, axırın xak olacaq. “**

(Bu divaninin Çaldıran döyüşündə deyildiyi ehtimal edilir. Beyt ilk dəfə Sədnik Paşayevin imzası ilə Gədəbəyin ’’Tərəqqi” qəzetində (24 iyul 1970-ci il) çap edilmişdir.

## DASTANLAR

***<u>1. Miskin Abdal və Sənubər dastanı</u>***

Bu məhəbbət dastanı Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ’’Miskin Abdal” (Bakı 2001) kitabında çap olunmuşdur.

***2. <u>Miskin Abdal və Şah İsmayıl dastanı</u>***

Bu tarixi dastan Göyçə mahalının Ağbulaq kənd sakini aşıq Abbasəli Abbasovdan yazıya alınmış və ilk dəfə ’’Miskin Abdal” (Bakı 2001) kitabında çap olunmuşdur.

***3. Yetim Hüsevn dastanı***

Bu dastanı Göyçənin Kərkibaş kəndindən olan folklorçu müəllim Zeynalabdin Cəfərov 1980-ci illərin əvvəllərində 100 yaşında dünyasını dəyişən dayısı Kərəm Orüc oğlu İsmayılovdan yazıya almışdır. İlk dəfədir, çap olunur.

## RƏVAYƏT

***1. Mehriban ayı nağılı***

Bunu Zeynalabdin Cəfərov dayısı Kərəm Oruc oğlu İsmayılovdan yazıya almış və ilk dəfə ’’Palitra” qəzetində (24.07.2001-ci il) çap olunmuşdur.


Miskin Abdalın soykökü
XIII əsr
Yaqub
İbrahim
İsmayıl
Yaqub Şeyx Səfiəddinlə dost imiş
XIV əsr
Əli
Cəfər
Məhəmməd
XV əsr
Miskin Abdal (Hüseyn)
Şadman
XVI əsr
Qənbər
Yağnalı
Yaqub
XVII əsr
Hüseyn
İsmayıl
Məhəmməd
XVIII əsr
Yafəs
Hacı Mehdi
Kərbəlayı Qənbər
XIX əsr
Məşədi Hasan
Hüseyn
Paşa
XX əsr
Məhəmməd
Tofiq
Mehdi
Müəllif: Əli Behbudoğlu 19.05.2000


Kərbəlayi Qənbər
1
Məşədi Həsən
2
Sarı Yaqub
3
Abdulla
4
Məşədi Qədim
Hüseyn
Məhəmməd
Qasım
Məşədi Alı
Paşa
Abuzər
Həsən
İsrafil
Ziyad
Məhəmməd
Lətif
Lalə
Sura
Əvəz
Təzəgül
Yazagül
Qədir
Eldar
Hüseyn
Yaşar
Novruz
Elvir
Pərvin
Ceyhun
Ülviyyə
Eşqin
Səadət
Nəcibə
Leyla
Elyar
Kəmalə
Şərqiyyə
Tofiq
Rafiq
Xalid
Ərəstun
Hüseyn
Şahanə
Turanə
Dünyamin
Xəyyam
Vüqar
Mehdi
Nuranə
Rafiq
Xalid
Xanlar
İlqar


1. (Davamı)
Məhəmməd
Abbas
Mahmud
Binnət
Dursun
Əli
Əsgər
Hümmət
Əhməd
Şölə
Müzəffər
Sayəddin
Nuru
Müslüm
Mahir
Mədəd
Qəməd
Vəfa
Oqtay
Akif
Zamin
Ramin
Azadə
Xəyalə
Tamella
Tünzalə
Elvina
Etibar
Elçin
Fərhad
Samir
Orxan
Kamil
Şamil
Daşdəmir
Dilman
Polad
Emil
Ramil
Zaur
Zamin
Rəqsanə
İradə

1. (Davamı)




(Şəcərənin bu qolunu Əhməd Mahmud oğlu Məmmədov toplamışdır).

2

*Sarı Yaqub*

Məşədi Məhəmməd
Kərbəlayı Mürsəl
Məşədi Əli
Kərbəlayı Mustafa
Ağabalı

Hüseyn
Həsən
Hümmət

Bəylər
Məhərrəm

Atlaz

Musa
Rəhim
Kərim

Mürvət

Malı
Uşu
Qəşəm

Məşdi
Elxan
İbrahim
Elbəyi

Qəzənfər
Yaqub
Cahan

Məhərrəm

Şahbaz

Yasin
Qaçay
Gəncəvi

Əfqan
Xosrov
Çingiz
Akif

Alik
Hikmət
Daşqın
Eşqin
Zəki

Esmira
Aynur
Ləman

Ceyhun

Afiq
Orxan

Hacı Hüseyn

Hacı Xıdır

İsgəndər
Məşədi Abbas
Cabbar

Mətləb
Məqsəd
Aftandil
Sabit

Vərqa
Sakit

Əli

Amin

Xıdır

2. Davamı


Kərbəlayı Mürsəl
Abdulla
Əsəd
Xəzəl
İsmixan
Müxtər
Mürsəl
Faiq
Səməndər
İlqar
Xeyrəddin
Mərdan
Mahmud
Turan
Maqsud
Vüsal
Tural
Rizvan
Ləman
Ərzuman
Elvin
Mürsəl


2. Davamı
Kərbəlayı Mustafa
Ablulla
Məhəmmədəli
Məmmədalı
Knyaz
Cahad
Həmzə
İbrahim
Sənan
Sultan
Nadir
Anar
Şahin
Arif
Oqtay
Aqşin
Gülnarə
Rəna
Leyla
Sevda
Yasin
Əfqan
Ayxan
Telman
Vaqif
Ramiz
Nicat
Anar
Elman
Vasif
Nigar
Naibə
Türkan

2. Davamı




(Şəcərənin bu qolunu Cahangir Hüseyn oğlu Məmmədov toplamışdır)


3
Abdulla
Əhməd
Bayram
Süleyman
Dünyamalı (Cəlal)
Həzrətqulu
Məsimalı
Süleyman
Güllüzar
Əbülfət
Süleyman
Hidayət
İbrahim
Nadir
Naqif
Əli
Nurlan
Şadman
Sənani
Hidayət
Famil
Vilayət
Zahid
Sahib
Sabir
Habil
Süleyman
Azər
Ayaz
Arzu
Rəşad
Arif
Zöhrab
Qərib
Əminə
Lamiyə
Abdulla


3. Davamı
Bayram
Xanış
Allahverdi
Almaz
Ərkinaz
Bayram
Cumalı
Abbas
Oruc
Qurban
Aqşin
Ruslan
Aydın
Bəxtiyar
Səxavət
Şura
Ziyarət
Abbas
Eşqin
Elmin
Əvəz
Xaliq
Ramiq
Murad
Muraz

3. Davamı




(Şəcərənin bu qolunu Arzu Vahid oğlu Əhmədov toplamışdır)


Məşədi Qədim
Məhərrəm
Əli
Namaz
Xıdır
Elləz
İsmayıl
Rəsul
Hüseyn
Ramazan
Xəlil
Məhəmməd
Zahid
Bəhman
İbrahim
Məmməd
Bəhrəm
Fəxrəddin
Zaman
Kamal
Firdovsi
Əlyar
Ənvər
Mirzə
Səbuhi
Heydər
Şəhriyar
Rauf
Telman
Əli
Qulu
Xalıqverdi
Allahverdi
Əhliman
Pəhlivan
Rizvan
İntiqam
Çingiz
Gündüz
Şəmşir
Bakir
Afiq
Şükür
Telman
Ramiz
Eldar
Ramil
Qərib
Elməddin
Şair
Aqil
Hüseyn
Qasım
Hüsen
Məsim
Çərkəz
Əli
Rahib
Qalib
Elxan
(Şəcərənin bu qolunu İbrahim Ramazan oğlu Namazov toplamışdır)



**Qədim Göyçə mahalında Basarkeçər rayonunun Sarıyaqub (əvvəlki adı Zəngərli) kəndində Miskin Abdalın yaşadığı evin yerində tikilmiş müasir ev (1988-ci il).**

# MÜNDƏRİCAT

**“Səfəvilərin böyük övliyası - Misnin Andal”**
**Tofiq HÜSEYNZADƏ**

**Azərbaycan dilində**

Nəşriyyat direktoru: Şəmsi VƏFADAR
İcraçı direktor: Fuad İSGƏNDƏROV
Bədii redaktor: Zaur RƏHMANLI
Texniki redaktor: Ramiz ƏLƏKBƏROĞLU
Korrektorlar: Rafiq HÜSEYNZADƏ,
Nuranə HÜSEYNZADƏ
Mətni yığdı: Rəna ƏLƏMMƏDOVA

Yığılmağa verilmişdir: 02.04.2005
Çapa imzalanmışdır: 05.05.2005
Kağız formatı 60x84 1/16
Ofset çapı. Sifariş: 19, Sayı: 1000 nüsxə
Qiyməti 30.000 (otuz min) manat




Azərbaycan Respublikası “ŞƏMS” nəşriyyatı
Bakı, Azl 122, Mətbuat p-r. 24, Telefon: 438-33-07, 432-08-22



TofiqMəhəmməd oğlu Hüseynzadə- 20.09.1946-cı ildə Qərbi Azərbaycanın Göyçə mahalının Basarkeçər rayonunun Sarıyaqub kəndində doğulmuşdur. Hələ orta məktəbdə oxuduğu illərdə Basarkeçər rayonunda nəşr olunan "Bolluq uğrunda" qəzetində məqalələri dərc olunmuş, həmçinin sinif və məktəb divar qəzetlərinin buraxılmasında yaxından iştirak etmiş, orta təhsilini başa vurduqdan sonra, 1965-1971-ci illərdə Azərbaycan Dövlət Pedoqoji İnstitutunda ali təhsil almış, tələbəlik illərindən "Gənc müəllim", "Sosialist Sumqayıtı" və digər mətbu orqanlarda şer və məqalələrlə çıxış etmişdir.

1970-1972-ci tədris illərində Qazax rayonunun Barxudarlı kənd məktəbində müəllim kimi çalışmış, 1972-ci ildən Basarkeçər rayonu Sarıyaqub kənd məktəbində pedoqoji fəaliyyətini davam etdirmiş, eyni zamanda, Vardenis (Basarkeçər) rayon partiya komitəsinin orqanı olan "Vardenis" qəzetində əvvəlcə ədəbi işçi, sonralar isə 1988-ci ilin məlum hadisələrinə qədər, qəzetin kənd təsərrüfatı şöbəsinin müdiri vəzifələrində çalışmışdır.

Həmin dövrdə Ermənistanda nəşr olunan mətbuat orqanlarında, o cümlədən, "Sovet Ermənistanı" qəzetində, habelə Azərbaycanda nəşr olunan mətbuat orqanlarında dəfələrlə şer və məqalələri dərc olunmuşdur. 1985-ci ildə Ermənistanda nəşr olunmuş "Ədəbi Ermənistan- 83" almanaxında şerləri dərc olunmuşdur.

T.Hüseynzadə 1988-ci ilin məlum hadisələrindən sonra ailəlikcə Bakı şəhərinə köçmüş, Bakı şəhərində pedoqoji və jurnalist fəaliyyətini davam etdirmiş, "Millət", "Yeni Azərbaycan" və "Haqq yolu" qəzetlərində jurnalist kimi çalışmış, digər mətbuat orqanlarında çoxsaylı məqalə və şerləri dərc olunmuş, mərkəzi televiziya və radioda dəfələrlə çıxışlar etmişdir.

1989-cu ildən başlayaraq ulu babası Miskin Abdal irsinin, habelə ümumilikdə, Göyçə folklorunun toplanılması məqsədilə müstəqil elmi araşdırmalara başlamış, həmçinin, Azərbaycan Milli Elmlər Akademiyasının Folklor Elmi-Mədəni Mərkəzi ilə bu sahədə əməkdaşlıq etmiş, Miskin Abdal haqqında ilk toplu nəşr olan, Azərbaycan Milli Elmlər Akademiyasının Ədəbiyyat İnstitutunun Elmi Şurasının qərarı ilə 2001-ci ildə nəşr olunmuş "Miskin Abdal" kitabının materiallarının toplanılmasında yaxından iştirak etmişdir.

Apardığı diqqətəlayiq tarixi araşdırmalar nəticəsində Miskin Abdalın həyat, fəaliyyət və yaradıcılığı barəsində maraqlı tarixi fakt və məlumatları toplamaqla, onun haqqında ikinci toplu nəşr olan hazırkı kitabı ərsəyə gətirmişdir.

2003-cü ildən Azərbaycan Milli Elmlər Akademiyasının Folklor İnstitutunun dissertantı kimi, Azərbaycan folkloru ilə bağlı elmi araşdırma üzərində çalışır.

Hazırda elmi, pedoqoji və jurnalist fəaliyyətini davam etdirir.

5 övladı və 3 nəvəsi var.